QƏZET 1958-ci İLDƏN
NƏŞR OLUNUR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
*Məhəmməd Peyğəmbər (S.)*

Oktyabr
2018
№ 8 (1095)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ



## “2019-2030-cu illər üçün Azərbaycan Respublikasının Məşğulluq Strategiyası”nın təsdiq edilməsi haqqında

### *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*

İnsan kapitalının inkişafı hesabına davamlı iqtisadi tərəqqinin təmin edilməsi müasir dövrdə Azərbaycan dövlətinin sosial-iqtisadi siyasətinin əsasını təşkil edir. Ötən illər ərzində bu sahədə kompleks tədbirlər həyata keçirilmiş, yüksək nailiyyətlər əldə olunmuşdur.

Ölkədə əmək ehtiyatlarından səmərəli istifadə, əhalinin məşğulluq və sahibkarlıq imkanlarının genişləndirilməsi, layiqli əməyin dəstəklənməsi, işçi qüvvəsinin rəqabətqabiliyyətliliyinin artırılması və əmək məhsuldarlığının yüksəldilməsi hesabına iqtisadi inkişafın təmin edilməsi Azərbaycan Respublikası Prezidentinin 2016-cı il 6 dekabr tarixli 1138 nömrəli Fərmanı ilə təsdiq edilmiş milli iqtisadiyyat və iqtisadiyyatın əsas sektorları üzrə strateji yol xəritələrində başlıca məqsədlər olaraq müəyyən edilmişdir.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, Azərbaycan Respublikasında mövcud demoqrafik meyillərə və inkişaf perspektivlərinə, ölkənin müəyyən olunmuş iqtisadi prioritetlərinə əsaslanmaqla səmərəli məşğulluğun təmin edilməsinə yönəldilmiş uzunmüddətli dövlət məşğulluq siyasətinin formalaşdırılması məqsədilə **qərara alıram:**

1. “2019-2030-cu illər üçün Azərbaycan Respublikasının Məşğulluq Strategiyası” təsdiq edilsin (əlavə olunur).

2. Bu Sərəncamın 1-ci hissəsi ilə təsdiq edilmiş Məşğulluq Strategiyasının həyata keçirilməsi üzrə əlaqələndirici orqan Azərbaycan Respublikasının Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyi müəyyən edilsin.

3. Azərbaycan Respublikasının Nazirlər Kabineti:

3.1. Azərbaycan Respublikasının Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyi, aidiyyəti dövlət orqanları və qurumları ilə birlikdə Məşğulluq Strategiyasının həyata keçirilməsinə dair 2019-2025-ci illər üçün Tədbirlər Planının layihəsini üç ay müddətində hazırlayıb Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin;

3.2. bu Sərəncamdan irəli gələn digər məsələləri həll etsin.

4. Azərbaycan Respublikasının Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyi Məşğulluq Strategiyasının həyata keçirilməsi ilə bağlı görülən işlər barədə ildə bir dəfədən az olmayaraq Azərbaycan Respublikasının Prezidentinə məlumat versin.

5. Məşğulluq Strategiyasının həyata keçirilməsi ilə bağlı tədbirlərin icrasının monitorinqini və qiymətləndirilməsini, Azərbaycan Respublikası Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyinin sifarişi əsasında, İqtisadi İslahatların Təhlili və Kommunikasiya Mərkəzi həyata keçirsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 30 oktyabr 2018-ci il*

## ADPU 12-ci Azərbaycan Beynəlxalq Təhsil Sərgisində təmsil olunub

***Oktyabrın 11-də Bakı Ekspo Mərkəzində 12-ci Azərbaycan Beynəlxalq Təhsil Sərgisinin açılış mərasimi keçirilib.***

***Açılış mərasimində Azərbaycan Respublikasının Prezidenti Administrasiyasının Humanitar siyasət məsələləri şöbəsinin müdiri Fərəh Əliyeva, Təhsil naziri Ceyhun Bayramov, təhsil müəssisələrinin rəhbərləri, müxtəlif təhsil xidmətləri göstərən qurumların nümayəndələri iştirak ediblər.***



Mərasimdə çıxış edən Təhsil naziri Ceyhun Bayramov bildirib ki, “Uşaqların gələcəyinə sərmayə” devizi altında təşkil edilən sərgi dünyanın 12 ölkəsindən 130-dan çox iştirakçını bir araya gətirib. T?hsil Nazirliyinin son illərdə təhsilin inkişafı sahəsində həyata keçirdiyi islahatların ayrı-ayrı pavilyonlarda əksini tapdığını vurğulayan nazir sərginin ziyarətçilər üçün faydalı olacağını deyib.

Ceyhun Bayramov qeyd edib ki, ölkə başçısı cənab İlham Əliyev tərəfindən təsdiq edilmiş “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyasının imzalanmasından ötən 5 il ərzində təhsilin müxtəlif pillələrini əhatə edən istiqamətlər üzrə mühüm dövlət sənədləri qəbul edilib və layihələr həyata keçirilib.

Sərgidə ölkənin bir sıra aparıcı ali təhsil müəssisələrinin də iştirak etdiyini bildirən Təhsil naziri diqqətə çatdırıb ki, son dövrlərdə ali təhsilin əhatəlilik səviyyəsi əhəmiyyətli şəkildə artıb. Belə ki, 2018-2019-cu tədris ili üzrə qəbul imtahanlarının nəticələrinə əsasən, əvvəlki illərlə müqayisədə rekord sayda - 41 min abituriyent tələbə adını qazanıb, 500 və daha çox bal toplayan məzunlar arasında 2090 nəfər müəllimlik ixtisasını seçib.

“Caspian Event Organisers” şirkətinin region üzrə direktoru Edvard Stroun artıq ənənəvi olaraq hər il keçirilən sərginin maraqla qarşılandığını, ziyarətçilərə təhsil müəssisəsi seçməkdə geniş imkan yaratdığını deyib.

Daha sonra 3 nömrəli Uşaq-Gənclər İnkişaf Mərkəzinin dərnək üzvləri çıxış edib, qonaqlar sərgi ilə tanış olublar.

Ötən illərlə müqayisədə Təhsil Nazirliyi sərgidə geniş pavilyonda təmsil olunub. Sərgidə iştirakçılara “Məktəbəhazırlıq”, “Olimpiadalara hazırlıq mərkəzi”, “Peşə Təhsili üzrə Dxvlət Agentliyi”, “Təhsil” Respublika İdman Mərkəzi, “Uşaq-Gənclər İnkişaf Mərkəzi”, “SABAH qrupları”, “İçərişəhər ənənəvi incəsənət mərkəzi”, “Sağlam təhsil-sağlam millət”, “Maarifçi” Tələbə Kredit Fondu, “Məktəblinin dostu”, “Modul tipli məktəblər”, “İT STEP”, “Media Mərkəz - Təhsil TV” və digər stendlər təqdim edilib.

Sərginin gündəliyinə işgüzar görüşlər, panel müzakirələr, media təqdimatlar və ayrı-ayrı mövzulara dair mühazirələr daxil edilib.

Sərginin baş sponsoru “Kapital Bank”-dır. Sərgi Azərbaycan Respublikasının Kiçik və Orta Biznesin İnkişafı Agentliyi, Azərbaycanda İxracın və İnvestisiyaların Təşviqi Fondu (AZPROMO) və Azərbaycan Respublikası Sahibkarlar (İşəgötürənlər) Təşkilatları Milli Konfederasiyası (ASK) tərəfindən də dəstəklənib, təşkilatçı qismində isə “Caspian Event Organisers” (“CEO”) şirkəti çıxış edib.

12-ci Beynəlxalq Təhsil Sərgisinə giriş yuxarı sinif şagirdləri, valideynlər, müəllim və tələbələr üçün açıq olub.

Qeyd edək ki, sərgidə ölkəmizin digər ali təhsil müəssisələri ilə yanaşı, Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) də təmsil olunub. ADPU-nun rektoru, professor Cəfər Cəfərov sərgidə Təhsil naziri Ceyhun Bayramova universitetin tədris və elmi fəaliyyəti, professor-müəllim heyətinin çap edilən kitabları, bukletləri, müəllim və tələbələrin əl işləri barədə ətraflı məlumat verib. ADPU-nun stendi ziyarətçilər tərəfindən maraqla qarşılanıb.

Sərgi oktyabrın 13-də başa çatıb.

**Mənsur İbrahimli**



## ADPU-nun nəzdində ADPK birinci oldu

"Məktəbgushesi.az" portalı "Hansı kollecin fəaliyyətini cəmiyyət üçün yararlı hesab edirsiniz?" virtual sorğusu keçirib.

Sorğunu təşkil etməkdə məqsəd müasirləşən təhsil sistemimizin inkişafında strateji istiqamətləri ön plana çəkmək, yenilən dünyada təhsilin ayrı-ayrı pillələrinə, o cümlədən, kolleclərə yeni prizmadan yanaşmaq olub.

Bir ay müddətində keçirilmiş sorğuda ümumilikdə 8527 respondent iştirak edib. Tanınmış təhsil ekspertlərinin də yaxından müşahidə etdiyi sorğu qısa zaman ərzində səs verən respondentlər arasında ciddi müzakirə mövzusuna çevrilib.

Sorğu nəticəsində I yeri 4414 səslə Azərbaycan Dövlət Pedaqoji Universitetinin nəzdində Azərbaycan Dövlət Pedaqoji Kolleci qazanıb.

## Yazıçı-tərcüməçi İmdad Avşarın ustad dərsi



Oktyabrın 1-də Türk dünyasının görkəmli ziyalısı, yazıçı-tərcüməçi, Azərbaycan Yazıçılar Birliyinin, Avrasiya Yazıçılar Birliyinin və Dünya Gənc Türk Yazıçılar Birliyinin üzvü İmdad Avşar Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Filologiya fakültəsinin III tədris ili tələbələrinə "Mirzə Fətəli Axundzadənin həyat və yaradıcılığı" mövzusunda ustad dərsi keçib. Ustad dərsini ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev, Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov izləyiblər.

Tədbiri giriş sözü ilə açan Sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev bildirib ki, İmdad Avşar Azərbaycanın yaxın dostudur. O, böyük yazıçı və mütəfəkkir, ictimai xadim Mirzə Fətəli Axundza-



dənin, həmçinin Azərbaycanın digər klassik yazıçılarının əsərlərini türk dilinə tərcümə edib. İmdad Avşar qardaş Türkiyədə Azərbaycan ədəbiyyatını geniş təbliğ edir. Professor F.Rzayev bu fəaliyyətinə görə İmdad Avşara təşəkkür edib və ona yeni yaradıcılıq uğurları arzulayıb.

Yazıçı-tərcüməçi İmdad Avşar açıq dərsin təşkilinə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib və universitetin kollektivinə uğurlar arzulayıb. Çıxışında Mirzə Fətəli Axundzadənin həyat və yaradıcılığı haqqında ətraflı məlumat verən məruzəçi bildirib ki, Mirzə Fətəli Axundzadə Şərq-İslam dünyasının böyük ziyalılarından biridir. O, şair, yazıçı, maarifçi, filosof və ictimai xadim olmuşdur. Azərbaycan dramaturgiyasının və Azərbaycan ədəbi tənqidinin banisidir.

Mirzə Fətəli Axundzadə həmişə cəmiyyətin yenilənməsi, müasirləşməsi, insan hüquqlarının qorunması, qadın azadlığı, sosial ədalət, dövlət-din münasibətlərinin sağlam əsaslar üzərində qurulması, xalqın maariflənməsi, mədəni inkişafı, mənəvi təkamülü uğrunda fədakar mübarizə aparıb. Böyük mütəfəkkir dini nadanlığın, cəhalətin, xurafatın barışmaz düşməni olub. Görkəmli şair Mirzə Şəfi Vazehlə tanışlığı və Tiflis mühiti onun dünyagörüşünün formalaşmasında mühüm rol oynayıb. Qərblə Şərqi dərindən müqayisə edən yazıçı-mütəfəkkir bu qənaətə gəlib ki, Şərqin Qərbdən geri qalmasının əsas səbəbi nadanlıq, cəhalət və savadsızlıqdır. Yumor və satiranı ictimai bəla və eyiblər əleyhinə mübarizədə ən güclü vasitə hesab edən yazıçı 6 ölməz komediya yaradıb və komediyaları ilə türk-müsəlman dünyasında dramaturgiyanın əsasını qoyub. Onun "Aldanmış kəvakib" povesti, "Kəmalüddövlə məktubları" bədii-fəlsəfi traktatı dini fanatizmin ifşası baxımından böyük əhəmiyyət kəsb edir. Mirzə Fətəli Axundzadənin xalqın maariflənməsi üçün yeni əlifba uğrunda apardığı mübarizə də çox təqdirəlayiqdir. Yazıçının bütün əsərləri, eləcə də din haqqında düşüncələri və fəlsəfi baxışları müasir dövrümüz üçün çox aktualdır.

Ustad dərsində İmdad Avşar gənc və tanınmış yazıçı, Filologiya fakültəsinin Azərbaycan və dünya ədəbiyyatı kafedrasının müəllimi, filologiya üzrə fəlsəfə doktoru Pərvin Nurəliyevanın və tələbə-gənclərin suallarını cavablandırıb, onlarla maraqlı fikir mübadiləsi aparıb.

**Mahirə Mustafayeva**



## "Əmək bazarı məlumatlarının konkret ixtisaslar üzrə təhsil proqramlarında nəzərə alınması üçün metodologiyanın-təlimatların işlənib-hazırlanması" mövzusunda seminar

Oktyabrın 10-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Azərbaycan ali təhsil sisteminin gücləndirilməsinə dəstək" adlı Tvinninq layihəsi çərçivəsində "Əmək bazarı məlumatlarının konkret ixtisaslar üzrə təhsil proqramlarında nəzərə alınması üçün metodologiyanın-təlimatların işlənib- hazırlanması" mövzusunda seminar keçirilib. Seminarda ADPU-nun rəhbərliyi, Təhsil Nazirliyinin nümayəndələri, fakültə dekanları, kafedra müdirləri, şöbə müdirləri, Bakı Dövlət Universitetinin və Sumqayıt Dövlət Universitetinin təmsilçiləri iştirak ediblər.

Seminarı giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, ADPU inkişaf edir. Biz bu inkişafı həyata keçirmək üçün həm ölkədaxili resurslardan, həm də xarici resurslardan istifadə edirik. Qabaqcıl beynəlxalq təcrübənin öyrənilib tətbiq edilməsi, xarici layihələrdə iştirak etməyimiz bizi qarşıya qoyduğumuz hədəf və məqsədlərə yaxınlaşdırır. Hədəfimiz təhsilin keyfiyyətinin yüksəldilməsi, yüksəkixtisaslı pedaqoji kadrların hazırlanması, ölkənin və regionun ən yaxşı universitetlərindən biri olmaqdır. Bu baxımdan, Tvinninq layihəsi mühüm əhəmiyyət kəsb edir. Avropa İttifaqı tərəfindən maliyyələşdirilən Tvinninq layihəsi Fransa, Litva, Latviya və Azərbaycanın birgə tərəfdaşlığı ilə həyata keçirilir. Tvinninq layihəsinin koordinatoru Fransanın Pedaqoji Araşdırmalar üzrə Beynəlxalq Mərkəzinin təmsilçisi Lisa Bydanovadır.

Rektor Cəfər Cəfərov qeyd edib ki, layihənin başlıca məqsədi Azərbaycan ali təhsil sistemini kompetensiyalara əsaslanan təhsil yanaşmasına uyğunlaşdırmaqla daha da inkişaf etdirməkdir. Layihənin hədəfi Avropa Ali Təhsil Məkanının prinsiplərinin, mexanizmlərinin, alətlərinin və siyasətlərinin davamlı surətdə tətbiq edilməsi məqsədilə Təhsil Nazirliyinin, ali təhsil müəssisələrinin və Akkreditasiya və Nostrifikasiya İdarəsinin institusional potensialını artırmaq və tələbələrə əsaslanan sistemə və təlim nəticələri yanaşmasına keçidi dəstəkləməklə onların həyata keçirilməsini və tətbiqini təmin etməkdir. Layihənin konsepsiyasında göstərilir ki, tələbələrə əsaslanan təlim təhsilalanlar üçün təlim mühitində keyfiyyətin transformasiyası prosesidir. Hədəf onların müstəqilliyinin və tənqidi bacarıqlarının nəticələrə əsaslanan yanaşma vasitəsilə artırılmasıdır. Layihənin komponentlərinə layihə çərçivəsində seçilmiş milli təhsil standartlarının kompetensiyalara əsaslanan yanaşmanı əks etdirməsi məqsədilə yenidən hazırlanması, prioritet sektorlar üzrə pilot təhsil proqramlarının tələbələrə əsaslanan yanaşmanı əks etdirməsi məqsədilə yaxşılaşdırılması, təhsil proqramlarının tələbələrə əsaslanan yanaşmanı əks etdirməsi məqsədilə keyfiyyət təminatı sisteminin daha da təkmilləşdirilməsi, hüquqi-tənzimləyici çərçivəyə düzəlişlərə dair tövsiyələrin verilməsi daxildir.

Tvinninq layihəsi çərçivəsində növbəti ekspert missiyası 8-12 oktyabr tarixlərində "Layihə çərçivəsində seçilmiş Milli Təhsil Standartlarının kompetensiyalara əsaslanan yanaşmanı əks etdirməsi məqsədi ilə yenidən hazırlanması" adlı 1-ci Komponentinin "Əmək bazarı məlumatlarının konkret ixtisaslar üzrə seçilmiş təhsil proqramlarında nəzərə alınması üçün metodologiyanın işlənib-hazırlanması" adlı 1.4 saylı Fəaliyyəti çərçivəsində həyata keçirilir.

Missiyanın məqsədi ali təhsil müəssisələrinin müvafiq nümayəndələrini əmək bazarının tələbinə dair toplanılmış məlumatların konkret ixtisaslar üzrə təhsil proqramlarında necə nəzərə alınması ilə bağlı məlumatlandırmaq, bu sahədə mövcud Avropa təcrübəsini bölüşmək və bu məqsədlə metodologiyanın-təlimatların işlənib-hazırlanmasından ibarətdir. Missiya fransalı qısamüddətli ekspert Didier Ronze, litvalı qısamüddətli ekspert Saule Maciukaite-Zviniene və latviyalı ekspert Jolanta Silka tərəfindən həyata keçiriləcək. Didier Ronze Fransanın Təhsil, Ali Təhsil və Tədqiqat Nazirliyinin nəzdindəki Fransada Ali Təhsilin və Tədqiqatın Keyfiyyətinin Yüksəldilməsi üzrə Şəbəkənin (RELİER) İdarəetmə Komitəsinin üzvüdür. Saule Maciukaite-Zviniene Litva prezidentinin təhsil məsələləri üzrə məsləhətçisidir. Jolanta Silka Litvanın Akademik Məlumat Mərkəzinin Akkreditasiya Şöbəsinin müdir müavinidir.

Missiya çərçivəsində Bakı Dövlət Universitetində, Azərbaycan Dövlət Neft və Sənaye Universitetində akademik heyətin iştirakı ilə seminarlar keçirilib.




Oktyabrın 12-də isə Gəncə Dövlət Universitetində seminarın keçirilməsi nəzərdə tutulur.

Seminarda latviyalı ekspert Jolanta Silka "Əmək bazarı məlumatlarının təhsil ixtisasları qrupundan seçilmiş konkret ixtisas proqramlarında nəzərə alınması" mövzusunda taqdimatla çıxış edib. Həmçinin ekspert Didier Ronze Fransa nümunəsi əsasında, ekspert Saule Maciukaite-Zviniene isə Litva nümunəsi əsasında məlumatları seminar iştirakçılarının diqqətinə çatdırıblar. Maraqlı və məzmunlu təqdimat və məlumatlarda əmək bazarının məlumatlarının öyrənilməsi, universitetlərlə işəgötürənlər arasında əlaqələrin gücləndirilməsi, təhsil proqramları hazırlanarkən sifarişçilərin tələblərinin nəzərə alınması, təhsil xidmətləri, mövcud təhsil standartları, pedaqoji fəaliyyət, yeni tədris planlarının hazırlanması, müəllim hazırlığının təkmilləşdirilməsi, ömürboyu təhsil və digər vacib məqamlar öz əksini tapıb.

Təhsil Nazirliyinin nümayəndəsi Yaşar Ömərov seminarın təşkil edilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib. Y.Ömərov qeyd edib ki, kompetensiya əsaslı mütəxəssis hazırlanması "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda əsas vəzifələrdən biri kimi qarşıya qoyulub. Tvinninq layihəsi bu vacib vəzifənin həyata keçirilməsinə öz töhfəsini verəcək.

Seminarda iştirakçıların sualları cavablandırılıb, maraqlı fikir mübadiləsi aparılıb.

Seminarın sonunda rektor Cəfər Cəfərov layihə çərçivəsində qarşıya qoyulan vəzifələrin layiqincə həyata keçirilməsi üçün öz tapşırıq və tövsiyələrini verib.

**Könül Nəzərova**

# 5 Oktyabr - Beynəlxalq Müəllimlər Gününə həsr edilmiş tədbir

Oktyabrın 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rəhbərliyi, professor-müəllim heyəti və tələbə kollektivi Fəxri Xiyabanda xalqımızın ümummilli lideri Heydər Əliyevin məzarını ziyarət edib, məzarı önünə əklil qoyub, gül dəstələri düzüb. Görkəmli oftalmoloq alim, akademik Zərifə Əliyevanın da xatirəsi ehtiramla yad edilib, məzarı önünə gül dəstələri düzülüb. Sonra isə universitetin Böyük Akt zalında 5 Oktyabr-Beynəlxalq Müəllimlər Gününə həsr edilmiş geniş tədbir keçirilib. Tədbirdə Təhsil Nazirliyinin məsul vəzifəli şəxsləri, Səbail Rayon İcra Hakimiyyətinin təmsilçiləri, ölkəmizin böyük və qabaqcıl universitetlərinin rektorları, prorektorları, təhsil ictimaiyyətinin nümayəndələri, təhsil ekspertləri, media strukturlarının rəhbərləri və əməkdaşları iştirak ediblər. Tədbirdə həmçinin 2018-2019-cu tədris ilində 500-dən yüksək bal toplayaraq müəllimlik ixtisasını seçən ADPU-nun, Bakı Dövlət Universitetinin, Azərbaycan Dillər Universitetinin, Bakı Slavyan Universitetinin və Xəzər Universitetinin tələbələri iştirak ediblər. Tədbir iştirakçıları əvvəlcə ADPU-nun müəllim və tələbələrinin rəsm əsərlərindən ibarət sərgi ilə tanış olublar. Tədbirdə öncə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov tədbiri giriş sözü ilə açaraq tədbir iştirakçılarını 5 Oktyabr-Beynəlxalq Müəllimlər Günü münasibətilə təbrik edib və uğurlar arzulayıb. Rektor bildirib ki, bu gün xalqımızın həyatında çox xoş və əlamətdar bir gündür. 5 Oktyabr-Beynəlxalq Müəllimlər Günü dünyanın bütün mədəni və mütərəqqi xalqlarının həyatına əlamətdar və mühüm tarixi bir gün kimi daxil olub. Birləşmiş Millətlər Təşkilatının (BMT) ali mədəniyyət qurumu olan UNESKO tərəfindən 1966-cı il oktyabrın 5-də verilən qərar əsasında hər il oktyabrın 5-də dünyada Beynəlxalq Müəllimlər Günü keçirilir. Beynəlxalq Müəllimlər Günü dünyanın 100-dən çox ölkəsində, o cümlədən Azərbaycanda qeyd olunur. Azərbaycan xalqı bu gözəl, şərəfli və müqəddəs bayramı böyük sevinc hissi və ruh yüksəkliyi ilə qeyd edir.




Müasir Azərbaycanın qurucusu, ulu öndərimiz Heydər Əliyev demişdir: "Müəllim adı dünyada ən yüksək addır. Şəxsən mən Yer üzündə müəllimdən yüksək ad tanımıram".







Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev müəllim adına, müəllim əməyinə yüksək qiymət verir. Dövlət başçımız demişdir: "Müəllim Azərbaycanda ən hörmətli insandır. Müəllimlər hər bir cəmiyyətin elitasıdır".

Təhsil sahəsinin inkişafında Azərbaycan Respublikasının Birinci vitse-prezidenti Mehriban xanım Əliyeva böyük xidmətlər göstərir. Həyatımızın ən vacib, aktual və həssas məsələlərinə böyük diqqət və qayğı ilə yanaşan Mehriban xanım Əliyevanın fəaliyyətinin əsas istiqamətlərindən birini məhz təhsilə xüsusi diqqət və qayğı təşkil edir.




Rektor Cəfər Cəfərov çıxışında vurğulayıb ki, Azərbaycanda müəllim peşəsinin nüfuzunun artırılması üçün böyük işlər görülür. Təhsil Nazirliyinin həyata keçirdiyi genişmiqyaslı islahatların əsas məqsəd və hədəflərindən biri müasir əmək bazarının tələblərinə cavab verən yüksəkixtisaslı pedaqoji kadrların hazırlanması və cəmiyyətdə müəllim peşəsinin ictimai nüfuzunun artırılmasıdır. Son illər bu sahədə ürəkaçan uğurlar, təqdirəlayiq nəticələr əldə edilib. İnanırıq ki, gerçəkləşdirilən məqsədyönlü fəaliyyət və səmərəli əməli tədbirlər nəticəsində ölkəmiz təhsil sahəsində, o cümlədən müəllim hazırlığında daha böyük uğurlar qazanacaq.

BMT tərəfindən "Təhsil əsri" adlandırılan XXI əsrdə Pedaqoji Universitet olaraq bizim üzərimizə müstəqil ölkəmiz üçün dərin və hərtərəfli biliyə malik, yüksək səviyyəli, geniş dünyagörüşlü, zəngin mənəviyyatlı, vətənpərvər və milli ruhlu pedaqoji kadrların hazırlanması düşür. Biz bu vəzifənin öhdəsindən layiqincə gəlmək üçün əzmlə, fədakarlıqla çalışmalı, müasir dövrün təhsil fəlsəfəsinə uyğun olaraq fəaliyyətimizdə kreativ olmalı, innovativ təşəbbüs və ideyaları tətbiq etməliyik.

Təhsil nazirinin müavini, Bakı Şəhəri üzrə Təhsil İdarəsinin müdiri vəzifəsini icra edən Məhəbbət Vəliyeva Təhsil Nazirliyinin rəhbərliyi adından tədbir iştirakçılarını təbrik edib və onlara uğurlar arzulayıb. Bildirib ki, təhsil cəmiyyətin inkişafında böyük rol oynayır. Məktəb infrastrukturunun yenilənməsi, məktəblərin maddi-texniki bazasının gücləndirilməsi, müasir informasiya-kommunikasiya texnologiyaları ilə təmin edilməsi, müəllimlərin bilik və bacarıqlarının diaqnostik qiymətləndirilməsinin keçirilməsi, əmək haqqlarının artırılması təhsilin keyfiyyətini yüksəldib. Müəllim təhsil prosesində əsas simadır. Ölkəmizdə uğurla həyata keçirilən təhsil islahatları cəmiyyətdə müəllim peşəsinə marağın artmasına səbəb olub. Bu il 2090 nəfər gənc 500-dən yüksək bal toplayaraq müəllim peşəsini seçib. 5 Oktyabr-Beynəlxalq Müəllimlər Gününə həsr edilmiş tədbirin müəllim hazırlığının mərkəzi hesab edilən ADPU-da keçirilməsi olduqca təqdirəlayiqdir.

ADPU-nun, Azərbaycan Milli Konservatoriyasının nəzdində Musiqi Kollecinin, Bakı Musiqi Akademiyasının, Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin müəllim və tələbələrinin hazırladıqları maraqlı və rəngarəng konsert proqramı tədbir iştirakçılarına yüksək əhval-ruhiyyə bəxş edib.

**Orxan Abdullayev**

# ADPU-nun alimləri Finlandiyada və Rusiyada səfərdə olublar

Finlandiyanın Saimaa Tətbiqi Elmlər Universitetinin rektoru, professor Anneli Pirttilanın dəvətinə və Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərovun müvafiq əmrinə əsasən Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov və İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, dosent Yaqut Rzayeva 28 sentyabr - 5 oktyabr 2018-ci il tarixlərdə Finlandiyada və Rusiyada səfərdə olublar. Səfər çərçivəsində sentyabrın 29-da A.S.Puşkin adına Leninqrad Dövlət Universitetinin Vıborq Filialının fəaliyyət istiqamətləri, həmçinin yeni texnologiyaların tədris prosesinə tətbiqi ilə tanış olublar. A.S.Puşkin adına Leninqrad Dövlət Universitetinin rəhbərliyi ilə yüksəkixtisaslı elmi və elmi-pedaqoji kadrların, o cümlədən "Korreksiya pedaqogikası" ixtisası üzrə elmi kadrların hazırlanması, elmi konfrans və simpoziumların birgə təşkili məsələlərində razılıq əldə edilib.



Nümayəndələrimiz Finlandiyanın Saimaa Tətbiqi Elmlər Universitetinin təşkilatçılığı ilə 1-5 oktyabr 2018-ci il tarixlərdə Lappeenranta şəhərində keçirilən "Saimaa Calling" beynəlxalq həftəsində iştirak ediblər. 22 ölkədən 100-ə qədər mütəxəssisin iştirak etdiyi beynəlxalq tədbirdə 25 mütəxəssisin, həmçinin Finlandiyanın elm, təhsil və mədəniyyət nazirinin online məruzəsi dinlənilərək müzakirə edilib. "Azərbaycanda müasir təhsil sisteminin modernləşdirilməsinin sosial-mədəni istiqamətləri" mövzusunda məruzə təqdim edilib.

Oktyabrın 2-də Saimaa Tətbiqi Elmlər Universitetinin rektoru, professor Anneli Pirttila ilə rəsmi görüşdə həmin universitetin və ADPU-nun fəaliyyət istiqamətləri, strukturu, uğurları barədə tərəflər bir-birlərinə məlumat veriblər. Saimaa Tətbiqi Elmlər Universiteti ilə ADPU arasında elm və təhsil sahəsində əməkdaşlığa dair, o cümlədən beynəlxalq layihələrdə birgə iştirak məsələlərinin müzakirəsindən sonra Finlandiya Universitetinin rektoruna hədiyyə, həmçinin Azərbaycan alimlərinin müəllifliyi ilə rus dilində nəşr edilmiş bir neçə monoqrafiya təqdim edilib.

"Saimaa Calling" beynəlxalq həftəsi oktyabrın 5-də Saimaa Tətbiqi Elmlər Universitetinin İmatra şəhərindəki kampusunda yerləşən Turizm fakültəsinin tələbələrinin hazırladıqları rəsmi banket və konsertlə yekunlaşıb.

# Türkiyə Respublikasının “Təhsil və məsləhət” Şirkətinin rəhbəri Erdem Söylemez ADPU-da



Orta məktəb müəllimlərinin bilik və bacarıqlarının artırılması sahəsində tanınmış ekspert, Türkiyə Respublikasının “Təhsil və məsləhət” Şirkətinin rəhbəri Erdem Söylemez oktyabrın 2-3-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) olub. Qeyd edək ki, Erdem Söylemez oktyabrın 2-də ADPU-nun II nömrəli tədris binasında “XXI əsr şagirdinin təhsilində müəllimin rolu” mövzusunda mühazirə ilə çıxış edib. Tədbirdə ADPU-nun Davamlı təhsil və təlim şöbəsinin müdiri, dosent İsrayıl İsgəndərov, şöbənin əməkdaşları, müəllimlər, magistrantlar və təkrar ali təhsil alan tələbələr iştirak ediblər.

Erdem Söylemez “XXI əsrin müəllimi necə olmalıdır? Tələbələrlə münasibətdə nələrə diqqət yetirməlidir?” və s. bu kimi önəmli mövzularda çıxış edib və tədbir iştirakçılarının suallarını cavablandırıb.

Oktyabrın 3-də isə ADPU-nun rektoru, professor Cəfər Cəfərov Erdem Söylemez və Azərbaycan İngilis Dili Müəllimləri Birliyinin rəhbəri Rəqsanə Məmmədova ilə görüşüb. Görüşdə ADPU-nun Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə,Tədris Departamentinin direktoru, dosent Sənan Əliyev, Davamlı təhsil və təlim şöbəsinin müdiri, dosent İsrayıl İsgəndərov iştirak ediblər.

Görüşdə müasir dövrdə Azərbaycan müəllimlərinin üzərinə düşən vəzifələr, ADPU-nun müəllim hazırlığı sahəsində həyata keçirdiyi işlər, bu sahədə qazandığı uğurlar və gələcək planları müzakirə edilib.

Görüşdə həmçinin Türkiyənin “Təhsil və məsləhət” Şirkəti, Azərbaycan İngilis Dili Müəllimləri Birliyi və ADPU arasında əməkdaşlıq perspektivləri, ADPU-nun professor-müəllim heyətinin bilik və bacarıqlarının artırılması imkanları müzakirə edilib.

# Tələbə Gənclər Təşkilatının təqdimatı

**Oktyabrın 10-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Gənclər Təşkilatının (TGT) I tədris ili tələbələri üçün təqdimatı keçirilib.**



Tədqimatda ADPU-nun Tədris işləri ürə prorektoru, dosent Eldar Aslanov, Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqı (ATGTİ) sədrinin müşaviri Hüseyn Babayev, ATGTİ-nin Mətbuat xidmətinin rəhbəri Ənvər İsmayılzadə, ATGTİ-nin Tələbə Kartı Departamentinin rəhbəri Xanım Paşayeva, Park Cinemanın satış meneceri Amil Hacıyev, TGT-nin üzvləri və I tədris ili tələbələri iştirak ediblər. Tədbirdə əvvəlcə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.



Tədbiri giriş sözü ilə açan Tədris işləri ürə prorektor, dosent Eldar Aslanov TGT-nin fəaliyyətini yüksək qiymətləndirərək qeyd edib ki, TGT ADPU-nun çoxminli tələbə heyətinin fəal və öncül hissəsidir. Vurğulayıb ki, sizin həyatınızda yeni və məsuliyyətli mərhələ başlayıb. Tələbəlik illəri insan həyatının ən maraqlı, ən gözəl dövrüdür. Tələbəlik illərinin özünəməxsus xüsusiyyətləri var. Siz yaxşı oxumaqla bərabər, universitetin və ölkəmizin ictimai həyatında, mədəni-kütləvi tədbirlərdə fəal iştirak etməli, asudə vaxtınızı səmərəli keçirməlisiniz. Siz savadlı, bilikli mütəxəssis və əsl vətəndaş kimi yetişməlisiniz. Dosent Eldar Aslanov çıxışının sonunda TGT-yə uğurlar arzulayıb.

TGT-nin sədri Taleh Budaqov çıxış edərək bildirib ki, təşkilat 2005-ci ildən fəaliyyət göstərir. TGT-nin strukturu, fəaliyyət istiqamətləri barədə tələbəgənclərə geniş məlumat verən T.Budaqov bildirib ki, TGT universitetin tələbələrinin ictimai-sosial həyatının zənginləşdirilməsi, onların savadlı mütəxəssis kimi yetişmələri, bilik və bacarıqlarının inkişafı üçün daim mühüm işlər həyata keçirir. TGT fəaliyyəti dövründə çoxsaylı layihələr, müxtəlif tədbirlər gerçəkləşdirib və bir çox uğurlara imza atıb. TGT ölkəmizdə keçirilən respublika və beynəlxalqmiqyaslı tədbirlərə dəstək verir. T.Budaqov onlara göstərilən diqqət və qayğıya görə ADPU-nun rəhbərliyinə təşəkkür edib.

Tədbirdə TGT-nin fəaliyyətini əks etdirən videoçarx nümayiş etdirilib.

ATGTİ sədrinin müşaviri Hüseyn Babayev tədbirdə çıxış edərək TGT-nin fəaliyyətini müsbət qiymətləndirib və uğurlar arzulayıb. Tədbirdə həmçinin ATGTİ-nin Mətbuat xidmətinin rəhbəri Ənvər İsmayılzadə təmsil etdiyi təşkilatın fəaliyyətini əks etdirən təqdimatla çıxış edib. ATGTİ-nin Tələbə Kartı Departamentinin rəhbəri Xanım Paşayeva Tələbə endirim kartı haqqında ətraflı məlumat verib. Park Cinemanın satış meneceri Amil Hacıyev Tələbə endirim kartının qeydiyyatında qalıb gəlmiş tələbəyə pulsuz cinema bileti təqdim edib.

Sonda Tələbə endirim kartının qeydiyyatında fəal iştirak etmiş tələbələrə təşəkkürnamələr təqdim edilib.

**Nurlan Səmədov**

# ADPU-da ingilis dilinin tədrisinin yüksəldilməsinə xüsusi diqqət ayrılır

**Tədrisin keyfiyyətinin yaxşılaşdırılması, öyrətmə və öyrənmə prosesinin pedaqoji və texnoloji ehtiyaclarının ödənilməsi üçün insan kapitalının inkişaf etdirilməsi olduqca vacibdir. Bu baxımdan, davamlı olaraq professor-müəllim heyətinin peşəkarlığının artırılması üçün universitetdə mütəmadi tədbirlər görülür. Belə önəmli addımlardan biri də ABŞ-ın Azərbaycan Respublikasındakı səfirliyinin maliyyə dəstəyi ilə həyata keçirilən, Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) və Azərbaycan Müəllim İnkişafı Mərkəzinin (AMİM) birgə layihəsidir. Aprel ayından başlanmış layihənin əsas məqsədi ADPU-da ingilis dilini tədris edən professor-müəllim heyətinin bacarıqlarının inkişaf etdirilməsidir.**



Layihə çərçivəsində ADPU-da mövcud olan hər iki kafedranın, həmçinin Şəki Filialının professor-müəllim heyəti prosesə cəlb edilmiş, ilk olaraq dil bilik səviyyələrinin müəyyənləşdirilməsi məqsədilə ölkəmizdə “Cambridge Assessment English Exam Centre”-in rəsmi nümayəndəsi AMİM tərəfindən “Cambridge English Placement Test (CEPT)” imtahanları təşkil edilmişdir. İmtahanların nəticələrinə əsasən yüksək nəticə əldə etmiş müəllimlər üçün “TKT Modul 1 - Dil tədrisinin əsasları” və “İngilis dili” adlı təlimlər təşkil edilmişdir. Cari ilin sentyabr ayından başlayan təlimlərdə ADPU üzrə 28 nəfər, Şəki Filialı üzrə 11 nəfər müəllim iştirak edir.

Oktyabrın 16-da CEPT imtahanlarından yüksək nəticə əldə etmiş və hazırda adıçəkilən təlimlərdə iştirak edən müəllimlərlə görüş keçirildi. Müəllimlik peşəsinin ucalığını qeyd edən rektor, professor Cəfər Cəfərov xarici dil bilməyin əhəmiyyətini qeyd etdi. Müasir dünyada müəllimlərin öz peşələri ilə yanaşı, ən azı iki xarici dildə danışmaq təcrübəsinin geniş yayıldığını vurğulayan rektor ali təhsil müəssisələrinin beynəlmiləlləşməsində, beynəlxalq reytinq cədvəllərində əsas göstəricilərdən biri kimi əcnəbi tələbələrin cəlbi prosesində xarici dillərin vacibliyinə toxundu. Bir ali təhsil müəssisəsi kimi gələcək nəsillərin formalaşmasında fəal rol oynamaq, daha çox beynəlxalq layihələr həyata keçirmək, digər ixtisaslar üzrə tədris aparan professor-müəllim heyətini də bu proseslərə cəlb etmək üçün əsas ağırlığın məhz ingilis dili müəllimlərinin üzərinə düşdüyünü bildirdi. Tədris prosesinin keyfiyyətinin artırılması məqsədilə görülən tədbirlərdə müəllimlərin fəal iştirakının vacib olduğunu qeyd edən professor Cəfər Cəfərov ABŞ Dövlət Departamentinin maliyyələşdirdiyi Fulbrayt proqramı çərçivəsində xarici mütəxəssislərlə əməkdaşlıq imkanlarına toxundu, müəllimləri təşəbbüskar olmağa səslədi. Çıxışının sonunda rektor görüş iştirakçılarına gələcək fəaliyyətlərində uğurlar arzuladı.

Müəllim mərkəzli tədrisdən tələbə mərkəzli sistemə keçidə toxunan Beynəlxalq əlaqələr üzrə prorektor Nigar Abbaszadə müəllimlərə uğurlar arzuladı.

Sonra Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov, İngilis dili və onun tədrisi metodikası kafedrasının müdiri, professor Nailə Sadıqova, İngilis dili kafedrasının müdiri, dosent Gülçöhrə Alıyeva, müəllimlər Gülhəyat Abdullayeva, Hicran Babayeva, Jalə Səmədova yaradılmış bu imkanlar üçün universitet rəhbərliyinə təşəkkür etdilər. Sonda xatirə şəkli çəkdirildi.

Eyni zamanda bildiririk ki, layihə çərçivəsində ADPU-da hazırlanan gələcək ingilis dili müəllimlərinin bilik səviyyəsini müəyyənləşdirmək məqsədilə “İngilis dili müəllimliyi” ixtisası üzrə təhsil alan tələbələr də prosesə cəlb edilmiş, CEPT imtahanlarında iştirak etmişlər. Qeyd edək ki, monitorinq xarakteri daşıyan bu imtahanlar tələbələrin ADPU-da verəcəkləri imtahan və Buraxılış Yekun Dövlət Attestasiyasının nəticələrinə heç bir çəkildə təsir göstərmir.

# ADPU-nun Quba Filialında “Radikal dini cərəyanlarla mübarizədə maarifçilik işinin təşkili” layihəsi çərçivəsində tədbir

Oktyabrın 2-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba Filialında “Dəyər” Mənəvi İrsin Təbliği İctimai Birliyinin təşkilatçılığı və Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin dəstəyi ilə Azərbaycan Respublikasının Prezidenti yanında Qeyri-Hökumət Təşkilatlarına Dövlət Dəstəyi Şurasının maliyyələşdirdiyi “Radikal dini cərəyanlarla mübarizədə maarifçilik işinin təşkili” layihəsi çərçivəsində maariflənd irmə tədbiri keçirilib.



Tədbirdə ADPU-nun Quba Filialının direktoru, professor Əli Allahverdiyev, Quba Rayon İcra Hakimiyyətinin (RİH) məsul işçisi Aynur Yəhyayeva, “Dəyər” Mənəvi İrsin Təbliği İctimai Birliyinin İdarə Heyətinin üzvü Rəşad Nəbiyev, Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin (DQİDK) Quba bölgəsi üzrə şöbəsinin əməkdaşı Elnur Ağasiyev, filialın müəllim və tələbə kollektivi iştirak edib.

Tədbirdə çıxış edənlər Azərbaycanda təkcə müsəlmanların deyil, digər dinlərin də nümayəndələrinin sərbəst və azad şəkildə yaşadıqlarını qeyd edib, dini radikalizmin yaranma səbəbləri, dini radikalizmlə mübarizə metodları və bu mübarizədə maarifləndirmənin əhəmiyyəti haqqında ətraflı danışıblar.

# “Dayanıqlı inkişaf məqsədləri” mövzusunda dəyirmi masa

Oktyabrın 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) və Azərbaycan İqtisadçılar İttifaqının birgə təşkilatçılığı ilə universitetdə “Dayanıqlı inkişaf məqsədləri” mövzusunda dəyirmi masa keçirilib. Dəyirmi masada ADPU-nun rəhbərliyi, Milli Məclisin İqtisadi siyasət, sənaye və sahibkarlıq komitəsinin sədri, Azərbaycan Milli Elmlər Akademiyasının həqiqi üzvü Ziyad Səmədzadə, fakültə dekanları, kafedra müdirləri, şöbə müdirləri, müəllim və tələbələr iştirak ediblər.




Dəyirmi masanı giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov akademik Ziyad Səmədzadəni universitetin kollektivi adından salamlayıb. Rektor ADPU-nun fəaliyyəti haqqında məlumat verərək bildirib ki, universitet 100 illik yubileyinə yaxınlaşır. Fəaliyyət göstərdiyi müddət ərzində ADPU xalqımıza, ölkəmizə böyük xidmətlər göstərib. ADPU-da 160 mindən çox pedaqoji kadr hazırlanıb. Onların arasında böyük alimlər, ictimai-siyasi xadimlər, ziyalılar var. ADPU-da filiallarla birlikdə 18 minə yaxın tələbə təhsil alır. Son illər ölkəmizdə həyata keçirilən səmərəli və məqsədyönlü tədbirlər nəticəsində müəllim peşəsinə maraq xeyli artıb. Dayanıqlı inkişafın kökündə təhsil, məktəb, müəllim dayanır. Universitetdə “Dayanıqlı inkişaf məqsədləri” mövzusunda dəyirmi masanın keçirilməsi təqdirəlayiqdir.

Tədbirdə akademik Ziyad Səmədzadə “Azərbaycanın davamlı inkişafı: reallıqlar, perspektivlər” mövzusunda məruzə ilə çıxış edib. Akademik Ziyad Səmədzadə qeyd edib ki, Azərbaycan müstəqilliyinin ilk illərində iqtisadi cəhətdən yoxsulluq şəraitində yaşayırdı. Xalqımızın ümummilli lideri Heydər Əliyev 1993-cü ildə yenidən hakimiyyətə qayıtdıqdan sonra Azərbaycan iqtisadi inkişaf yoluna çıxdı. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin ulu öndər Heydər Əliyevin müdrik dövlətçilik kursunu uğurla davam etdirməsi nəticəsində bu inkişaf daha da sürətləndi. Azərbaycan ötən 25 il ərzində iqtisadi cəhətdən dünyanın bir çox ölkələrini geridə qoyub. Ölkəmizdə əhalinin məşğulluğu, ərzaq təhlükəsizliyi təmin edilib. Yoxsulluq səviyyəsi 49 faizdən 5 faizə enib. Beynəlxalq maliyyə böhranına baxmayaraq, ötən illər ərzində Azərbaycan öz dinamik inkişaf sürətini qoruyub-saxlaya bilib. Dövlət idarəçiliyinin təkmilləşdirilməsi, iqtisadiyyatın davamlı inkişafı və modernləşdirilməsi, xalqın rifahının yüksəldilməsi məsələləri uğurla həll edilir. Dövlət başçısının düşünülmüş və uzaqgörən siyasəti nəticəsində ölkəmizdə qeyri-neft sektoru inkişaf edir. Azərbaycan regionun lider dövləti olaraq, dünyadakı yerini və mövqeyini daha da gücləndirib. Azərbaycanın regionları sürətlə inkişaf edir, yeniləşir, müasirləşir. Bu da dayanıqlı inkişafın məqsədlərindən biridir. Ümumilikdə dayanıqlı inkişaf həyatımızın bütün sahələri ilə bağlıdır. Azərbaycan dövləti son 15 ildə qarşısına qoyduğu bütün iqtisadi hədəflərə çatıb.

Professor Asəf Zamanov, professor Buludxan Xəlilov, dosent Şahin Pənahov, kimya üzrə elmlər doktoru Əli Zalov, dosent Aydın Ələkbərov və başqaları maraqlı və aktual əhəmiyyət kəsb edən məruzəyə görə akademik Ziyad Səmədzadəyə təşəkkür edərək dayanıqlı inkişafla bağlı öz fikir və mülahizələrini bölüşüblər.

**Mahirə Məhərrəmqızı**

# “Yüksəlişin sirri” sənədli filminin nümayişi



Oktyabrın 22-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) müəllim və tələbələri üçün “Kür-Xəzər” Xeyriyyə İctimai Birliyinin Azərbaycan Respublikasının Prezidenti yanında Qeyri-Hökumət Təşkilatlarına Dövlət Dəstəyi Şurasının maliyyə dəstəyi ilə həyata keçirdiyi “Azərbaycanın Milli Qəhrəmanı Samid İmanov haqqında “Yüksəlişin sirri” adlı sənədli film” layihəsi çərçivəsində hazırlanmış “Yüksəlişin sirri” sənədli filmi nümayiş etdirilib. Qeyd edək ki, filmin ssenari müəllifi tanınmış jurnalist, Qarabağ müharibəsi veteranı İlham Tumas, rejissoru Anar Şuşalı, redaktoru tanınmış jurnalist, Qarabağ müharibəsi veteranı Rey Kərimoğlu, məsləhətçisi hərbi vətənpərvərlik mahnılarının ifaçısı Şəmistan Əlizamanlıdır.

Tədbirdə millət vəkilləri Arif Rəhimzadə, Flora Qasımova, Sona Əliyeva, Qarabağ müharibəsi veteranları, hərbçilər, mədəniyyət və incəsənət xadimləri, ziyalılar, qeyri-hökümət təşkillarlarının təmsilçiləri və kütləvi informasiya vasitələrinin əməkdaşları iştirak ediblər. Tədbirdə öncə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.

Tədbiri giriş sözü ilə açan ADPU-nun Humanitar və sosial məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev tədbir iştirakçılarını universitetin rəhbərliyi adından salamlayıb və bildirib ki, universitetdə “Yüksəlişin sirri” sənədli filminin nümayiş etdirilməsi çox vacib bir hadisədir. 2016-cı ilin Aprel döyüşləri müasir tariximizin parlaq səhifəsidir. Aprel döyüşlərində xalqımızın vətənpərvər və igid oğulları böyük qəhrəmanlıq nümayiş etdiriblər. Gənclər Aprel döyüşlərində qəhrəmanlıq göstərən oğullarımızdan nümunə götürməli, xalqa, Vətənə, dövlətə sədaqətlə xidmət etməlidirlər.




Sonra “Yüksəlişin sirri” sənədli filmi nümayiş etdirilib.

Tədbirdə layihə çərçivəsində hazırlanmış ”İgidim” marşı da nümayiş olunub. Marşın sözlərinin və musiqisinin müəllifi Gülqədəm Mirzəzadədir.

Tədbirdə çıxış edən Milli Qəhrəmanın həyat yoldaşı Badam İmanova, millət vəkili Sona Əliyeva, professor Paşa Qəlbinur, Dünya Azərbaycanlıları Konqresinin vitse-prezidenti Xəzər Emin, Xalq artsiti, Ankara Gazi Universitetinin profesoru Əflatun Nemətzadə, AZTV-nin əməkdaşı Elnar Məmmədli, Qarabağ müharibəsi veteranı Rey Kərimoğlu, Filologiya fakültəsinin II tədris ili tələbəsi Aytac Əliyeva və başqaları Azərbaycanın Milli Qəhrəmanı Samid İmanova həsr edilmiş filmin ərsəyə gəlməsində əməyi keçən hər kəsə təşəkkür ediblər və filmin pedaqoji kadr hazırlığının mərkəzi hesab edilən ADPU-da nümayiş etdirilməsinin məqsədəuyğun olduğunu qeyd ediblər. Çıxışlarda gənclərin vətənpərvərlik ruhunda tərbiyə edilməsinin vacibliyi və düşmən üzərində qələbəyə inam xüsusi vurğulanıb.

Sonda layihənin rəhbəri, “Kür-Xəzər” Xeyriyyə İctimai Birliyinin sədri, Azərbaycan Respublikası Ağsaqqallar Şurasının Məclis üzvü Akif Kərimov tədbirin keçirilməsinə verdiyi dəstəyə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib və belə flim təqdimatlarının gənclərin mənəvi tərbiyəsinə ciddi təsir etdiyini bildirib. Qeyd edib ki, “Yüksəlişin sirri” sənədli filmi Azərbaycanın Milli Qəhrəmanı Samid İmanovun qəhrəmanlığının gənclər arasında təbliğ edilməsi baxımından mühüm əhəmiyyət kəsb edir.

**Sənan İmanov,**
**Filologiya fakültəsinin**
**II tədris ili tələbəsi**

# “Azərbaycan arxeologiyasının əsasları” adlı dərs vəsaitinin təqdimatı

Oktyabrın 22-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tarix və coğrafiya fakültəsində tarix elmləri doktoru, Əməkdar jurnalist Qafar Cəbiyevin “Azərbaycan arxeologiyasının əsasları” adlı dərs vəsaitinin təqdimatı keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, Tarix və coğrafiya fakültəsinin müəllim və tələbələri, respublikamızın tanınmış və nüfuzlu tarixçi- alimləri iştirak ediblər. Qeyd edək ki, Qafar Cəbiyev 5 monoqrafiyanın, 100-dən çox elmi, 300-dən çox elmi-publisistik məqalənin müəllifi, ”Qızıl qələm” mükafatı laureatıdır. Milli Televiziya və Radio Şurasının üzvüdür.



Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov öncə tədbirin təşkilatçılarına təşəkkür edib və onlara uğurlar arzulayıb. Universitet haqqında məlumat verən rektor bildirib ki, ADPU böyük elm və təhsil ənənələrinə malikdir. ADPU fəaliyyət göstərdiyi müddət ərzində 160 mindən çox kadr hazırlayıb. Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) 10 prezidentinin 3-ü ADPU-nun məzunlarıdır. Hazırda bu ali məktəbdə 18 minə yaxın tələbə təhsil alır. 8 fakültə, 35 kafedra fəaliyyət göstərir. ADPU-nun 5 filialı var. Azərbaycan Dövlət Pedaqoji Kolleci ADPU-nun nəzdində fəaliyyət göstərir. Tədris 4 binada aparılır. Builki tələbə qəbulunun nəticələri ADPU üçün çox uğurlu olub. Belə ki, bu il ADPU-ya filiallarla birlikdə 500-dən çox bal toplayaraq qəbul olunan tələbələrin sayı 566 nəfərə çatıb. Cari tədris ilində ADPU-ya filiallarla birlikdə 600-dən çox bal toplayaraq qəbul olunan tələbələrin sayı 15 nəfər olub. Biz ADPU-da tədrisi yeni, müasir metodlar əsasında qurmağa çalışırıq. Bu gün universitetimizin kollektivinin həyatında əlamətdar bir gündür. ADPU-da “Azərbaycan arxeologiyasının əsasları” adlı dərs vəsaitinin təqdimatının keçirilməsi olduqca təqdirəlayiqdir. Biz tələbə-gəncləri dərin biliyə malik, milli ruhlu, vətənpərvər, müasir düşüncəli yetişdirməyə çalışırıq. Bu baxımdan, belə təqdimatlar mühüm əhəmiyyət kəsb edir.




Tarix elmləri doktoru, Əməkdar jurnalist Qafar Cəbiyev çıxış edərək təqdimatın keçirilməsinə verdiyi dəstəyə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib və universitetin kollektivinə uğurlar arzulayıb. Qeyd edib ki, Azərbaycan ərazisində 100 illərdir ki, tədqiqatlar aparılır. Arxeologiya qədim tarixi abidələri tədqiq edən bir sahədir və tarix elmi üzərində dayanır. Mənim uzun illər boyu apardığım araşdırmalar, elmi-tədqiqatlar bu əsərdə cəmlənib.

AMEA-nın Arxeologiya və Etnoqrafiya İnstitutunun direktoru, professor Maisə Rəhimova, AMEA-nın həqiqi üzvü, Əməkdar elm xadimi Teymur Bünyadov, AMEA-nın müxbir üzvü, ADPU-nun Ümumi tarix kafedrasının müdiri, professor Vəli Əliyev, BDU-nun professoru Cahangir Məmmədli, ADPU-nun Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov və digər alimlər çıxış edərək “Azərbaycan arxeologiyasının əsasları” adlı dərs vəsaitini yüksək elmi səviyyəyə malik bir əsər kimi səciyyələndiriblər və müəllifə yeni-yeni uğurlar arzulayıblar.

Təqdimatda tələbələrin sualları cavablandırılıb, maraqlı fikir mübadiləsi aparılıb.

**Nurlan İftixaroğlu**

# ADPU-nun Şəki Filialında dövlət müstəqilliyinin bərpasının 27-ci ildönümü münasibətilə konfrans

Oktyabrın 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki Filialında dövlət müstəqilliyinin bərpasının 27-ci ildönümünə həsr olunmuş “Dövlət müstəqilliyimizin bərpası ən yeni tariximizin zəfər salnaməsidir” mövzusunda elmi-nəzəri konfrans keçirilib. Konfransda filialın direktoru, riyaziyyat üzrə elmlər doktoru, dosent Rafiq Rasulov, elmi işlər üzrə direktor müavini, dosent Nurəli Çələbiyev, tərbiyə işləri üzrə təşkilatçı Xuraman Həmidova, professor-müəllim heyəti və tələbələr iştirak ediblər.




Konfransı filialın direktoru, dosent Rafiq Rasulov açaraq dövlətimizin müstəqillik illərində qazandığı uğurlar barədə konfrans iştirakçılarına məlumat verib. Sonra filialın Humanitar fənlər kafedrasını müdiri, tarix üzrə fəlsəfə doktoru Vüsal Baxışovun “18 oktyabr ən yeni tariximizdə ali məqamdır” mövzusunda məruzəsi dinlənilib.

Konfransda Humanitar fənlər kafedrasının baş müəllimi T.Məhərrəmov “Dövlət müstəqilliyinin bərpası haqqında Konstitusiya Aktı dövlətçilik tariximizin mühüm hadisəsi kimi”, “Azərbaycan dili və ədəbiyyatı müəllimliyi” ixtisasının IV tədris ili tələbəsi Lalə Əyyubzadə “Milli müstəqillik illərində təhsildə inkişaf tendensiyaları”, “Tarix və coğrafiya müəllimliyi” ixtisasının IV tədris ili tələbəsi Aytac Əhmədova “Azərbaycan Respublikası ulu öndər Heydər Əliyevin hakimiyyəti illərində” mövzularında çıxışlar ediblər.

Sonda filialın direktoru, dosent R.Rasulov yekun sözü ilə çıxış edərək bildirib ki, Azərbaycanın dövlət müstəqilliyinin bərpa edilməsi xalqımızın böyük tarixi nailiyyəti və ən dəyərli mənəvi sərvətidir. Onu gözbəbəyi kimi qorumaq, dövlətçilik ruhunu yaşatmaq, sonrakı nəsillərə ötürmək hər bir vətəndaşın müqəddəs amalı və borcu olmalıdır

# Elmi Şuranın iclası

**Oktyabrın 24-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının iclası keçirilib. ADPU-nun rektoru, Elmi Şuranın sədri, professor Cəfər Cəfərov iclası giriş sözü ilə açaraq bildirib ki, iclasın gündəliyinə "ADPU-da tədrisin keyfiyyətinin yüksəldilməsi sahəsində görülmüş işlər və qarşıda dayanan vəzifələr haqqında" hesabat, "Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsinin fəaliyyəti haqqında" hesabat və cari məsələlər daxildir.**

Rektor Cəfər Cəfərov qeyd edib ki, təhsilin keyfiyyətinin yüksəldilməsi bizim əsas vəzifəmiz, başlıca məqsədimizdir. Son vaxtlar ADPU-nun bu sahədə qazandığı uğurlar göz önündədir. "Məktəbguşəsi.az" saytının keçirdiyi virtual sorğunun nəticələrinə əsasən ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kolleci böyük səs çoxluğu ilə kolleclər arasında birinci yer tutub. Artıq cəmiyyətdə ADPU haqqında müsbət ictimai fikir formalaşıb. Biz qazanılan nailiyyətlərlə kifayətlənməməli, fəaliyyətimizi gücləndirməli, qarşımıza qoyduğumuz hədəf və məqsədlərə çatmaq üçün daha əzmlə çalışmalıyıq.

Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov "ADPU-da tədrisin keyfiyyətinin yüksəldilməsi sahəsində görülmüş işlər və qarşıda dayanan vəzifələr haqqında" hesabatla çıxış edib. Dosent E.Aslanov çıxışında bildirib ki, akademik keyfiyyət dedikdə 4 yanaşma ortaya çıxır: 1. Keyfiyyət ancaq ən yaxşı standartlar sayəsində ortaya çıxır. 2. Keyfiyyət qəbul edilmiş standartlara uyğunluq ölçüsündə ortaya çıxır. 3. Keyfiyyət ali təhsil müəssisəsinin özü üçün təyin etdiyi hədəf və missiyanı nə dərəcədə reallaşdırdığı ilə əlaqəlidir. 4. Keyfiyyət təşkilati muxtariyyət çərçivəsində yaxşılaşdırma səylərinin davamlılığıdır. Sadə dildə desək, bu, keyfiyyətli abituriyent, keyfiyyətli infrastruktur, keyfiyyətli müəllim, keyfiyyətli tədris planı və məzmun, keyfiyyətli qiymətləndirmə, keyfiyyətli təcrübə proqramı, keyfiyyətli diplom, keyfiyyətli məzun, keyfiyyətli müəllim, keyfiyyətli universitet deməkdir. Tədrisin keyfiyyəti üzrə beynəlxalq və milli çağırışlar mövcuddur. Bolonya prosesinin əsas məqsədləri təhsilin keyfiyyətinin artırılması, biliyin keyfiyyətinin yüksəldilməsi və ona olan tələbatın dünya miqyasında artması, Avropa universitetlərinin bir-biri ilə inteqrasiyası, vahid kredit sisteminin yaradılması, ali təhsil sənədlərinin və ixtisaslarının Avropa məkanında qarşılıqlı tanınması, tələbələrin mobiliyinin təmin olunmasıdır. "Azərbaycan 2020: gələcəyə baxış" İnkişaf Konsepsiyasında müasir təhsil sisteminin formalaşdırılmasında, təhsil sisteminin səmərəliliyində, onun nailiyyətlərinin formalaşmasında müəllim amilinin həlledici əhəmiyyəti nəzərə alınmaqla müəllim hazırlığının gücləndirilməsinə xüsusi önəm verilir. "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda I strateji istiqamət səriştəyə əsaslanan şəxsiyyətyönümlü təhsil məzmununun yaradılmasına yönəlmişdir və təhsilin məktəbəqədər, ümumi, ilk peşə-ixtisas, orta ixtisas və ali olmaqla, bütün pillələri üzrə kurikulumların inkişafı kimi vacib hədəfi əhatə edir. II strateji istiqamət təhsil sahəsində insan resurslarının müasirləşdirilməsini nəzərdə tutur. Bu istiqamət innovativ təlim metodlarını tətbiq edən, təhsilin məzmununun səmərəli mənimsənilməsini təmin edən səriştəli təhsilverənlərin formalaşdırılmasına xidmət edir və özündə təhsilverənlərin peşəkarlığının yüksəldilməsi, təhsilalanların nailiyyətlərinin qiymətləndirilməsi üzrə yeni sistemlərin qurulmasını, təhsilalanların istedadının aşkar olunması və inkişafı ilə bağlı, habelə xüsusi qayğıya ehtiyacı olanlar üçün inklüziv təlim metodologiyasının yaradılmasını ehtiva edir. III strateji istiqamət təhsildə nəticələrə görə cavabdeh, şəffaf və səmərəli idarəetmə mexanizmlərinin yaradılmasını nəzərdə tutur.



Ali təhsilin keyfiyyət göstəriciləri sisteminə abituriyentlərin hazırlıq səviyyəsi, təhsil proqramları,beynəlmiləlləşmə,elm və innovasiya informasiya resursları,təhsilverənlərin peşəkarlığı və elmi-pedaqoji səviyyəsi,mütərəqqi tədris texnologiyaları, maddi-texniki baza və s. daxildir.

ADPU-da tədrisin keyfiyyət göstəricilərini artırmaq üçün Strateji iş planı qəbul olunub, yazılı imtahan forması tətbiq edilib, şəffaflıq və obyektivlik təmin edilib, tələbə qəbulunda keyfiyyəti artırmaq üçün tanışlıq görüşləri keçirilib, maddi-texniki bazanın yaxşılaşdırılması üçün təmir işləri aparılıb, keyfiyyət göstərcilərinin izlənməsi sistemi formalaşmağa başlayıb, müəllimlərin və tədris-yardımçı heyətin işə qəbulu sistemi gücləndirilib, beynəlxalq əlaqələr genişləndirilib və keyfiyyətə yönəlmiş layihələr artırılıb. Reytinq qiymətləndirmə sistemi yaradılıb, xarici dillərin tədrisi ilə məşğul olan müəllimlərin bacarıqlarının artırılması davam edir, tələbələrin səviyyə qruplarına bölünməsi, informatika müəllimlərinin serifikatlaşdırılması həyata keçirilib, kitabxana fəaliyyətinin yenidən təşkili prosesinə start verilib, ixtisasların fakültə və kafedralara, fənlərin kafedralara rəsmən təhkim olunması gerçəkləşib, müasir təhsil texnologiyaları ilə bağlı təlimlər keçirilir, elektron universitet yaradılır. ADPU Elmi Şurasının qərarı ilə 2018-2019-cu tədris ili «Keyfiyyət ili» elan olunub. Dosent E.Aslanovun çıxışında qarşıda duran əsas vəzifələr və strateji hədəflər də öz geniş əksini tapıb.

ADPU-nun nəzdində ADPK-nin direktoru, hüquq üzrə fəlsəfə doktoru Qulu Novruzov, professor Nizami Xudiyev, professor Himalay Qasımov, professor Vəli Əliyev, professor Fərrux Rüstəmov, professor Nailə Verdizadə, dosent Şahin Pənahov və başqaları hesabatın aktual mövzuya həsr olunduğunu bildirərək onu yüksək qiymətləndiriblər.

Elmi Şura dosent E. Aslanovun hesabatını qəbul edib.

"Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültənin fəaliyyəti haqqında" hesabatla fakültənin dekanı, dosent Laçın Həsənova çıxış edib. Dosent L.Həsənovanın çıxışında fakültənin strukturu, maddi-texniki bazası, elmi-pedaqoji kadr potensialı, professor-müəllim heyətinin tədris və elmi-tədqiqat fəaliyyəti öz dolğun əksini tapıb. Qeyd edib ki, hazırda fakültədə 3 kafedra-Musiqi və onun tədrisi metodikası, Təsviri incəsənət və onun tədrisi metodikası, Fiziki tərbiyə və çağırışaqədər hazırlığın tədrisi metodikası kafedraları fəaliyyət göstərir. 80 nəfər professor-müəllim heyəti çalışır. 925 nəfər tələbə təhsil alır. Onlardan 92 nəfər tələbə "Musiqi müəllimliyi" ixtisası üzrə, 528 nəfər tələbə "Təsviri incəsənət müəllimliyi" ixtisası üzrə, 305 nəfər tələbə "Fiziki tərbiyə və çağırışaqədər hazırlıq müəllimliyi" ixtisası üzrə təhsil alır. Fakültədə ali təhsilin bakalavriat səviyyəsində tələbələr "Musiqi məllimliyi", "Təsviri incəsənət müəllimliyi", "Fiziki tərbiyə və çağırıçaqədər hazırlıq müəllimliyi" ixtisasları üzrə təhsil alırlar. Magistratura səviyyəsində isə "Musiqinin metodikası və metodologiyası", "Təsviri incəsənət fənninin tədrisi metodikası və metodologiyası", "Fiziki tərbiyə və çağırışaqədər hazırlıq fənninin tədrisi metodikası və metodologiyası" ixtisasları tədris olunur.

Fakültənin missiyası fəaliyyətində rəhbər tutduğu dəyərlərə və strateji məqsədlərinə uyğun təhsil vermək, ümumbəşəri bilik və bacarıqlara yiyələnmiş fərdlər yetişdirmək, elmə töhfələr verəcək, ölkəmizdə və dünyada yararlı ola bilən bilik yaradacaq və onu ötürə biləcək, cəmiyyətin sosial, mədəni, incəsənət və idman həyatının inkişafına kömək göstərə biləcək tədbirlər həyata keçirməkdir.

Fakültənin əsas dəyərləri təlim-tərbiyə işinin yüksək səviyyədə qurulması, elmi araşdırmaların aparılması, reklam və ictimaiyyətlə əlaqələrin yaradılması, insan resurslarının inkişaf etdirilməsidir. Bu dəyərlər haqqında fakültənin strateji planında geniş şərh verilib. Fakültənin tələbələri elmi araşdırmalar apararaq məqalələrlə Tələbə Elmi Cəmiyyətinin konfranslarında çıxış edirlər. Fakültə müxtəlif mədəni-kütləvi tədbirlər, layihələr həyata keçirir. Fakültənin müəllim və tələbələri universitet və respublika miqyasında, həmçinin beynəlxalq miqyasda keçirilən müsabiqələrdə, sərgilərdə iştirak edərək sanballı uğurlar qazanıblar. Eyni zamanda fakültədə gənclərin hərbi-vətənpərvərlik tərbiyəsinin gücləndirilməsi üçün səmərəli və məqsədyönlü tədbirlər gerçəkləşdirilir. Fakültədə istedadlı gənclərin universitetə cəlb edilmələrinə, abituriyentlərin ixtisas seçimi zamanı fakültəyə üstünlük vermələrinə xüsusi diqqət yetirilir və bu istiqamətdə layihələr həyata keçirilir. Bütövlükdə fakültə fəaliyyətini universitet rəhbərliyinin tapşırıq və göstərişləri əsasında, həyata keçirilən islahatlar çərçivəsində qurur.

Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsində aparılmış monitorinqin nəticələri barədə Monitorinq qrupunun rəhbəri, Keyfiyyətin təminatı şöbəsinin müdiri, siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqov məlumat verib.

Elmi Şura dosent L.Həsənovanın hesabatını qəbul edib.

İclasda universitetdə uzun illər səmərəli elmi-pedaqoji fəaliyyətləri nəzərə alınaraq Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsinin Fiziki tərbiyə və çağrışaqədərki hazırlığın tədrisi metodikası kafedrasının professoru Rafiq Baxşəliyev təşəkkürnamə, Riyaziyyat və informatika fakültəsinin dekanı, professor Maqsud Nəcəfov, Tarix və coğrafiya fakültəsinin Türk və Şərqi Avropa xalqlarının tarixi və tarixin tədrisi metodikasının professoru Mais Əmrahov, Kitabxana-İnformasiya Mərkəzinin direktoru Azər Hüseynov, Kimya və biologiya fakültəsinin Ümumi kimya və kimyanın tədrisi metodikası kafedrasının professoru Ələkbər Qurbanov fəxri fərmanla təltif ediliblər.

Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vaqif Əliyev adları çəkilən şəxslərin həm də gənc nəslin təlim-təbiyəsindəki xidmətlərinə görə Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin fəxri fərmanına və pul mükafatına layiq görülmələri barədə Elmi Şura üzvlərinə məlumat verib.

İclasda həmçininTəhsil Nazirliyinin həyata keçirdiyi "Sağlam təhsil-sağlam millət" layihəsində fəal iştirak etdiyinə görə İbtidai təhsil fakültəsinin Pedaqoji təhsilin problemləri elmi-tədqiqat laboratoriyasın müdiri, dosent Gülşən Novruzovaya nazirliyin təşəkkürnaməsi, Riyaziyyat və informatika fakültəsinin Hesablama riyaziyyatı və informatika kafedrasının professoru Əbülfət Pələngova Rusiya Təbiət Elmləri Akademiyasının müxbir üzvü seçilməsinə görə həmin akademiyanın diplomu təqdim edilib.

Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov Finlandiya və Rusiyaya səfərlərinin nəticələri barədə və cari məsələlər haqqında məlumat verib. Cari məsələlər müzakirə olunub və müvafiq qərarlar qəbul edilib.

Elmi katib, siyasi elmlər üzrə fəlsəfə doktoru Asif Axundov Elmi Şuranın qərarlarını Şura üzvlərinin diqqətinə çatdırıb.

İnzibati və iqtisadi işlər üzrə prorektor Ümid Mehdiyev universitetin əmlakına və mövcud resurslarına qayğı ilə yanaşılmasının və onlardan səmərəli istifadə edilməsinin vacibliyini vurğulayıb.

Sonda rektor Cəfər Cəfərov Elmi Şuranın iclasında qarşıya qoyulan vəzifələrin yüksək səviyyədə həyata keçirilməsi üçün öz tapşırıq və tövsiyələrini verib.

**"Gənc müəllim"**

# Wollongong Universitetinin rektoru və Qlobal Karyera İnstitutunun nümayəndələri ilə görüş

Oktyabrın 26-da Dubayda yerləşən Wollongong Universitetinin rektoru, professor Mohammed Salam, Qlobal Karyera İnstitutunun və Girne Amerikan Universiteti Multikultural Departamentinin direktoru Orxan Həsənoğlu, Qlobal Karyera İnstitutunun nümayəndəsi Sevinc Allahverdiyeva Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) qonağı olublar.



Görüşdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, İnzibati və iqtsadi işlər üzrə prorektoru Ümid Mehdiyev, Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə, Beynəlxalq əlaqələr şöbəsinin mütəxəssisləri Lətif Kəngərlinski və Günay Məhərrəmova iştirak ediblər.

Qonaqları salamlayan rektor Cəfər Cəfərov universitetin tarixi, tədris prosesi, tələbə həyatı, qarşıda duran vəzifələr barədə məlumat verib. Görüşdə Wollongong Universiteti ilə əməkdaşlıq imkanları da müzakirə edilib.

Görüş zamanı iki ali təhsil müəssisəsi arasında müvafiq formada əməkdaşlığın qurulması, xüsusilə də tələbə mübadiləsi, ADPU-nun müəllim və professor heyətinin kurslara, mühazirələrə, konfranslara cəlb olunması kimi mühüm fəaliyyəti təşkil etmək məqsədilə əməkdaşlıq müqaviləsi imzalanıb. Dubayda ali təhsil müəssisələrindən, eləcə də rəhbərlik etdiyi ali təhsil müəssisəsindən, təhsil proqramlarından və imkanlarından bəhs edən professor Mohammed Salam göstərilən diqqətə görə təşəkkürünü bildirib.

# Avropa İttifaqının tədqiqatın inkişafı və innovasiya ilə bağlı layihəsi çərçivəsində xarici ekspertlərin iştirakı ilə görüş

Oktyabrın 30-da Varşava Universitetinin ekspertləri Dr. Jacek Gajewski, Kristof Qulda və Təhsil İnstitutunun Ali təhsilin inkişafı şöbəsinin müdiri Anar Nağıyev Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) olublar.



Görüşdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov, Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə, Tədris Departamentinin direktoru, dosent Sənan Əliyev, Elm və innovasiyalar şöbəsinin müdiri, dosent Yusif Alıyev, Beynəlxalq əlaqələr şöbəsinin mütəxəssisləri Lətif Kəngərlinski və Günay Məhərrəmova iştirak ediblər.

Qonaqları salamlayan rektor Cəfər Cəfərov universitet və filialları, tədris prosesi, qarşıda duran vəzifələr, aparılan islahatlar, təhsilverənlərin fəaliyyətinin təkmilləşdirilməsi və keyfiyyəti nəticələr əldə edilməsi məqsədilə universitetə dəvət olunmuş ekspertlər, müəllimlərin reytinq qiymətləndirilməsi, kitabxana sisteminin inkişafı üçün görülən işlər haqqında məlumat verib.

Görüşdə Azərbaycan ali təhsil müəssisələrində innovasiya və tədqiqatın inkişafının gücləndirilməsi layihəsi, layihənin məqsədləri, fəaliyyəti, hədəf qrupları müzakirə edilib.

Görüş zamanı ADPU-da təhsil alan doktorantlar, tədqiqatçılar haqqında ətraflı məlumat verən Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov elmi jurnallar və hər il çap olunan məqalələr, dissertasiya işləri və məqalələrin antiplagiat sistemdə yoxlanması məsələlərinə toxunub.

ADPU-nun tərəfdaş olduğu beynəlxalq layihələrin universitetin inkişafına faydasını qeyd edən prorektor Nigar Abbaszadə layihə çərçivəsində görülən işlərdən və əldə edilən nəticələrdən danışıb.

Görüşdə qonaqların innovasiya texnologiyaları, doktorantlar və tədqiqatçılar üçün nəzərdə tutulan layihələr barədə sualları cavablandırılıb. Sonda qonaqlar göstərilən diqqətə görə təşəkkür ediblər.

# İctimai təşkilatların nümayəndələri və fəal tələbələrlə görüş

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Həmkarlar İttifaqı Komitəsi "Azedu.az" təhsil portalının 12 ali təhsil müəssisəsi arasında keçirdiyi "Azərbaycanda hansı universitetin Tələbə Həmkarlar İttifaqı Komitəsi daha aktiv fəaliyyət göstərir?" sorğusunun nəticələrinə əsasən I yeri tutub. Həmçinin ADPU-nun tələbələri Azərbaycan Respublikasının Gənclər Fondunun keçirdiyi 11-ci qrant müsabiqəsində 6 qrant layihəsini qazanıblar. Bu münasibətlə oktyabrın 31-də ADPU-da tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, fakültə dekanları, dekan müavinləri, kafedra müdirləri, şöbə müdirləri, ictimai təşkilatların nümayəndələri, fəal tələbələr iştirak ediblər.



Görüşü giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov Tələbə Həmkarlar İttifaqı Komitəsini və qrant layihələrini qazanan tələbələri təbrik edərək onlara təhsildə və ictimai fəaliyyətlərində yeni-yeni uğurlar arzulayıb. Rektor qeyd edib ki, bu gün universitetimizin kollektivinin həyatında xoş və sevincli bir gündür. Son iki ayda ADPU iki böyük uğur qazanıb. "Azedu.az" təhsil portalının və "Məktəbguşəsi.az"saytının keçirdiyi müvafiq sorğuların nəticələrinə əsasən ADPU I yerə layiq görülüb. ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kolleci (ADPK) də "Məktəbguşəsi.az" saytının keçirdiyi virtual sorğunun nəticələrinə görə I yeri tutub. Bu uğurlar bizi çox sevindirir və qarşımıza qoyduğumuz hədəf və məqsədlərə çatmağımıza səmərəli təsir göstərir. Belə mütərəqqi təşəbbüslər, ideyalar təbliğ edilməli, bu fəaliyyətin miqyası genişləndirilməlidir. Bu sahənin mütəxəssisləri universitetimizə cəlb edilməli, təlimlər, seminarlar, kurslar təşkil edilməlidir. Beynəlxalq layihələrdə iştirak etməyimiz üçün aparıcı xarici dilləri yaxşı bilməyimiz olduqca vacibdir.

ADPU-nun Tələbə Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vuğrun Məmmədov çıxış edərək göstərilən diqqət və qayğıya görə universitetin rəhbərliyinə, eləcə də sorğuda qalib gəlmələrinə dəstək verən hər kəsə təşəkkür edib. Bildirib ki, Tələbə Həmkarlar İttifaqı Komitəsinin qələbəsi ümumilikdə ADPU-nun qələbəsidir. Dosent V.Məmmədov çıxışında təmsil etdiyi təşkilatın fəaliyyəti və gələcəkdə həyata keçirəcəyi tədbirlər barədə ətraflı məlumat verib.

Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin baş mütəxəssisi Sahil Qələndərov, tələbələr Lamiyə Rzayeva, Ləman Vəliyeva, Nərmin Əhmədova, Xaliq Abbasov, Şıxməmməd Şıxməmmədov qazandıqları qrant layihələri haqqında danışıblar. Tələbə Gənclər Təşkilatının sədri Taleh Budaqov tələbələrin sosial fəallığının artırılması üçün görülən işlər haqqında məlumat verib.

Professor Fikrət Rzayev, professor Fərrux Rüstəmov, dosent Şahin Pənahov, dosent Yusif Alıyev çıxış edərək tələbə-gənclərin qrant layihələri ilə bağlı fəaliyyətlərinin təkmilləşdirilməsi, layihələrin tədris prosesinə tətbiqi və digər vacib məqamlar barəsində öz fikir və mülahizələrini bölüşüblər.

Sonda xatirə şəkli çəkdirilib.

**Günay Bağırlı**

## Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində elmi seminar

Oktyabrın 23-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində "Müasir dövrün ən geniş yayılmış nitq patologiyası-dizartriya" mövzusunda elmi seminar keçirilib. Elmi seminarda Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin dekanı, pedaqogika üzrə elmlər doktoru Şəhla Əliyeva, dekan müavini, dosent Allahyar İmanov, Məktəbəqədər təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, professor Müseyib İlyasov, Korreksiyaedici təlim kafedrasının müdiri Nailə Hüseynova və fakültənin ixtisas kafedralarının əməkdaşları iştirak ediblər.



Korreksiyaedici təlim kafedrasının dosenti Səbinə Aslanova "Müasir dövrün ən geniş yayılmış nitq patologiyası-dizartriya" mövzusunda çıxış edib.

Seminarda dizartriya kimi ağır nitq qüsurunun müasir dövrdə geniş yayılması və diaqnostikasında müxtəlif çətinliklərin yaradılması haqqında təqdimat aparılıb. Eyni zamanda dizartriyanın formalarının böyüklərdə və uşaqlarda təsnifləşdirilməsi və digər patologiyalarla birgə özünü göstərməsi təqdim olunub. Dizartriyanın erkən diaqnostikasına xüsusi diqqət yetirilərək, onun erkən diaqnostikası zamanı bu nitq patologiyasının formasının müəyyən olunması həyata keçirilib.

Məruzəçi mövzu ətrafında fakültə əməkdaşlarının suallarını cavablandırıb və mövzu ətrafında maraqlı müzakirələr aparılıb.

## Fizika və texnologiya fakültəsinin Elmi Şurasının geniş tərkibdə iclası

Oktyabrın 31-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Fizika və texnologiya fakültəsinin Elmi Şurasının geniş tərkibdə iclası keçirilib. İclasın gündəliyinə "Fizika və texnologiya fakültəsində tədrisin keyfiyyəti sahəsində görülən işlər və vəzifələr haqqında", "ADPU-nun Elmi Şurasının son iclasının qərarlarının icrası haqqında" və cari məsələlər daxil edilib.



"Fizika və texnologiya fakültəsində tədrisin keyfiyyəti sahəsində görülən işlər və vəzifələr haqqında" fakültənin dekanı, Elmi Şuranın sədri, dosent Arzu Daşdəmirov geniş və ətraflı məlumat verib. Elmi Şuranın sədri təhsildə keyfiyyət, təhsildə keyfiyyət üçün beynəlxalq və milli tələblər, ali təhsildə keyfiyyət göstəriciləri, fakültədə keyfiyyət üçün görülmüş işlər, fakültənin keyfiyyət üzrə vəzifələri və göstəriciləri, reytinq qiymətləndirməsi (universitet, milli və beynəlxalq) haqqında hazırladığı slaydlarla Elmi Şura üzvlərini məlumatlandırıb. Dosent A.Daşdəmirov qeyd edib ki, "Azərbaycan 2020: gələcəyə baxış" İnkişaf Konsepsiyasında təhsil sisteminin səmərəliliyində, onun nailiyyətlərinin formalaşmasında müəllim amilinin həlledici əhəmiyyətini nəzərə almaqla müəllim hazırlığının gücləndirilməsinə xüsusi önəm verilir. Bütün ümumi təhsil müəllimləri üçün fəa/interaktiv təlim texnologiyaları və inklüziv təhsil üzrə məqsədli ixtisasartırma təmin ediləcək, hər bir müəllimin İKT bacarıqlarına yiyələnməsi üçün çevik sistem yaradılacaq. Bu istiqamətdə biz də səylərimizi artırmalı, müvafiq kadrların pedaqoji prosesə cəlb edilməsinə çalışmalıyıq. Bununla yanaşı, həm də son 5 ilin qəbul göstəriciləri, son 5 ilin məzunlarının işə qəbul göstəriciləri,son 5 ildə beynəlxalq instinad jurnallarında çap sayı, son 5 ildə qazanılmış layihələrinin sayını təhlil etməli və müvafiq tədbirlər görməliyik.



Sonra professor Edil Eyvazov, professor Vaqif Nəsirov, professor Şükür Əlizadə, dosent Aydın Ələkbərov, baş müəllim Hüseyn Aslanov çıxış edərək fakültədə tədrisin keyfiyyətinin yüksəldilməsi sahəsində görülən işlərin qənaətbəxş olduğunu qeyd edərək bu sahədə bir sıra təkliflər irəli sürüblər.

Gündəlikdə dayanan 2-ci məsələ ilə bağlı dosent A.Daşdəmirov çıxış edərək ADPU-nun Elmi Şurasının son iclasında qəbul edilmiş qərarlar haqqında geniş və ətraflı məlumat verib.

Cari məsələlərdə bəzi fənlər üzrə hazırlanmış proqramlar təsdiq edilib, 2018-2019-cu illər üçün magistr mövzuları və elmi rəhbərlərin təsdiq edilməsi haqqında qərar qəbul edilib.

## Kimya və biologiya fakültəsinin Elmi Şurasının iclası

Oktyabrın 31-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Kimya və biologiya fakültəsinin Elmi Şurasının iclası keçirilib. Fakültənin dekanı, Elmi Şuranın sədri, dosent Elnarə Mehbalıyeva 2018-2019-cu tədris ilinin payız semestrində kafedralar üzrə keçiriləcək açıq dərslərin qrafiki ilə Şura üzvlərini tanış edib. Müxtəlif kafedralar üzrə təqdim olunan açıq dərslərin qrafiki müzakirə olunaraq təsdiq olunub.



Elmi Şurada kurs işləri, sərbəst işlərin tələbələrə verilməsinin vəziyyəti, habelə 2018-ci ildə yerinə yetirilmiş elmi-tədqiqat işlərinin müzakirəsi ilə bağlı kafedra müdirlərinin məlumatları dinlənilib. 2018-ci ildə magistraturaya qəbul olunmuş magistrantların elmi rəhbərləri və dissertasiya mövzuları müzakirə olunaraq təsdiq edilib.

Elmi katib, kimya üzrə fəlsəfə doktoru Gülnarə Babayeva cari məsələlərlə Elmi Şura üzvlərini tanış edib. 1 proqramın, 2 dərs vəsaitinin və 1 metodik vəsaitin müzakirə olunaraq nəşr olunması məqsədəmüvafiq hesab edilib.

## Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsinin Elmi Şurasının geniş tərkibdə iclası



Oktyabrın 29-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültəsinin Elmi Şurasının geniş tərkibdə iclası keçirilib. Fakültənin dekanı, Elmi Şuranın sədri, dosent Laçın Həsənova oktyabrın 24-də universitetin Elmi Şurasının iclasında fakültənin hesabatı haqqında etdiyi çıxış barədə fakültənin əməkdaşlarına ətraflı məlumat verib. Eyni zamanda Elmi Şuranın iclasında Monitorinq qrupu tərəfindən səsləndirilən qeydləri əməkdaşların diqqətinə çatdırıb.

Fakültənin Elmi Şurasının iclasında Keyfiyyətin təminatı şöbəsinin müdiri, siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqov iştirak edib. R.Sadıqov universitetdə keçirilən "Reytinq qiymətləndirilməsi" layihəsinin geniş təqdimatını edib.

Təqdimatdan sonra maraqlı və geniş müzakirələr aparılıb.

## ADPU-nun Cəlilabad Filialında 18 Oktyabr - Dövlət Müstəqilliyi Gününə həsr olunmuş tədbir

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Cəlilabad Filialında oktyabrın 18-də Azərbaycanın Dövlət Müstəqilliyi Gününə həsr olunmuş tədbir keçirilib.

Tədbirin əvvəlində Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib. Tədbirdə giriş sözü ilə çıxış edən filialın direktoru, dosent Xudayar Sultanlı tədbir iştirakçılarını təbrik edib, onlara uğurlar arzulayıb. X.Sultanlı Dövlət Müstəqilliyi Gününün tarixinə nəzər salaraq, bu günü Azərbaycanın tarixinin şanlı səhifəsi kimi dəyərləndirən dövlət başçısı cənab İlham Əliyevin fəaliyyəti dövründə qazanılmış böyük uğurlardan danışıb. Tarix üzrə fəlsəfə doktoru Mürvət Abbasov 18 Oktyabr -Dövlət Müstəqilliyi Günü haqqında geniş məruzə ilə çıxış edib. Bildirib ki, Azərbaycanın ikinci dəfə müstəqilliyə qovuşmasının əsası ümummilli lider Heydər Əliyevin Azərbaycana rəhbərlik etdiyi dövrdə qoyulub. Müasir Azərbaycan Prezident İlham Əliyevin rəhbərliyi ilə sürətli inkişaf dövrünü yaşayır.



Çıxış edən filialın baş müəllimi Tofiq İsgəndərov Azərbaycanın müstəqillik qazanmasından sonra ədəbiyyatımıza, incəsənətimizə, mətbuatımıza və təhsilə olan dövlət qayğısından danışıb.

Tədbir tələbələrin çıxışları, şeir və musiqi nömrələrinin təqdim edilməsi ilə davam edib, Dövlət Müstəqilliyi Gününə həsr olunmuş videoçarx nümayiş olunub.

Daha sonra ADPU-nun Cəlilabad Filialının direktoru, dosent X.Sultanlı, müəllim və tələbələri Cəlilabad rayonunun Heydər Əliyev Mərkəzində Dövlət Müstəqilliyi Günü ilə əlaqədar keçirilən tədbirdə iştirak ediblər.

Tədbirdə müstəqilliyimizin möhkəmləndirilməsində ümummilli liderimiz Heydər Əliyevin rolundan, Ulu Öndərin layiqli siyasi davamçısı olan İlham Əliyevin müstəqilliyimizin əbədiliyini təmin etməsindən, ölkəmizin dünyaya tanıdılmasındakı əvəzsiz xidmətlərindən danışılıb. Bildirilib ki, Azərbaycan Prezidentinin apardığı uğurlu daxili və xarici siyasət nəticəsində respublikamız dinamik inkişaf edir.

# Şərəfli alim-müəllim ömrü

Maqsud Ağaqulu oğlu Nəcəfov 1948-ci ildə Qərbi Azərbaycanın Zəngəzur mahalında, Sisian rayonunun Ağudi kəndində anadan olub. 1966-1971-ci illərdə Bakı Dövlət Universitetinin (BDU) Mexanika-riyaziyyat fakültəsində ali təhsil alıb, fərqlənmə ilə bitirib.

1972-1975-ci illərdə Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Diferensial və inteqral tənliklər" ixtisası üzrə aspiranturada əyani təhsil alıb. 1975-ci ildən Ümumi riyaziyyat kafedrasında, 1986-cı ildən Cəbr və ədədlər nəzəriyyəsi kafedrasında laborant, baş laborant kimi fəaliyyət göstərib, 1989-cu ildən Həndəsə kafedrasında müəllim, baş müəllim, dosent vəzifələrində çalışıb. 1983-cü ildə "Sinqulyar həyəcanlanmış gecikən arqumentli adi diferensial tənliklər üçün optimal idarə məsələsi" mövzusunda dissertasiya müdafiə edərək fizika-riyaziyyat elmləri namizədi elmi dərəcəsi alıb. 1998-2001-ci illərdə ADPU Riyaziyyat fakültəsinin dekan müavini işləyib. 2001-ci ildən həmin fakültənin dekanıdır. 1999-cu ildən bu yana keçirilən 3 bələdiyyə seçkisində Xətai Bələdiyyəsinin üzvü seçilib, hazırda Xətai Bələdiyyəsinin yerli sosial məsələlər daim komissiyasının sədridir.

"Maksimum və minimum məsələləri"-1999, "Analitik həndəsədən mühazirələr"-2013, "Ekstremum məsələləri"-2016, "Diferensial həndəsədən mühazirələr" 2016-cı illərdə çap olunmuş dərs vəsaitlərinin və 70-dən çox elmi-metodik məqalənin müəllifidir. Hazırda Cəbr və həndəsə kafedrasında "Analitik həndəsə", "Həndəsənin əsasları", "Diferensial həndəsə" fənlərini tədris edir. 2012-ci ildə "Silindrik və konik örtüklərin aeroelastik rəqsləri və dayanaqlığı" mövzusunda doktorluq dissertasiyası müdafiə edib, riyaziyyat üzrə elmlər doktoru elmi dərəcəsini alıb.

Respublikanın ictimai-siyasi həyatında da fəal iştirak edir. Ulu öndər Heydər Əliyevə müraciət edən 91 vətənpərvər ziyalıdan biri olub. Təhsilin inkişafında xidmətlərinə görə Prezident İlham Əliyevin sərəncamı ilə "Tərəqqi" medalı (2007-ci il) və "Əməkdar müəllim" fəxri adı ilə (2012) təltif olunub.

ADPU-nun Riyaziyyat və informatika fakültəsinin dekanı, riyaziyyat üzrə elmlər doktoru, professor Maqsud Nəcəfovun adı gələndə gözlərimiz önündə möhtəşəm elm və idrak yolunun yorulmaz yolçusu, dərin bilikli, geniş erudisiyalı, yüksək intellektə sahib, güclü məntiqi ilə seçilən ziyalı, cəfakeş alim, zəngin səriştəli təhsil fədaisi, xalqın, Vətənin gələcəyi olan gənc nəslin yollarına nur ələyən müdrik pedaqoq, peşəkar müəllim, gözəl övladlar böyütmüş qeyrətli ata, gül kimi nəvələri ilə sevinən nurani baba, xeyrimizin-şərimizin yaraşığı olan el ağsaqqalı,



yüksək idellar uğrunda hər cür çətinliklərə sinə gərən əvəzolunmaz şəxsiyyət, gözəl və kamil insan, əqidə yoldaşı, etibarlı sirdaş, ilqarı dürüst dost, dar günün dayağı qardaş obrazlarının mükəmməl sintezi dayanır.

Maqsud müəllim bütöv, harmonik və son dərəcə koloritli şəxsiyyətdir. Mənəvi ucalıq, təbiilik, sadəlik və səmimiyyət onun əsas xüsusiyyətləridir. Onda süni şəkildə mənliyini uca tutmaq cəhdi yerli-dibli yoxdur, təkəbbür ondan çox uzaqdır. Lakin bütün hallarda mənliyini ləyaqəti ilə uca tutmağı bacarır və onun ucalığı hər yerdən, bütün məsafələrdən açıq-aydın görünür. Hansı tərəfdən yanaşsan, bu bənzərsiz şəxsiyyət fərəh və qürur hissi doğurur. Ən eyforik məqamlarda, ən burulğanlı dəqiqələrdə, emosional vəziyyətlərdə belə öz təmkinini itirmir, fərdi xarakterinin üstünə kölgə salmır. Onun təbiətindəki təbii mütənasiblik hec vaxt pozulmur. Maqsud müəllimdə sözün həqiqi mənasında bir uşaq səmimiliyi var, istənilən adamla ünsiyyəti mehribanlığa, doğmalığa çevirə bilir. Səmimi söhbətləri, mənalı danışığı estetik zövqə keçir, nitqində ana dilimizin zənginliyi, zərifliyi, intonasiya çalarları öz əksini tapır.

Onun sözü sükuta, sükutu sözə çevirmək qabiliyyəti çox güclüdür. Bu məziyyətlər Maqsud müəllimin istedad sferası, peşəsi ilə məhdudlaşıb qalmır. O, bütün cəhətləri sintez etməyi bacaran intellekt sahibidir. Təbiidir ki, qazandığı nüfuzun arxasında əmək təşəbbüskarlığı, alın təri dayanır. O, özünü, sözünü elmi istedadını həmişə arxa bildiyi zəhməti ilə sevdirib.

Maqsud müəllim yüksək mənəvi dəyərləri olan insandır. Onda snobizm - özündən yuxarılara səcdə, özündən aşağıya həqarətli baxış stixiyası tamamilə yaddır. O, tutduğu vəzifələrin hamısında həmişə özünü, sözünü, fitri qabiliyyətini təsdiq etmişdir. Vəzifəsinin mərtəbəsindən asılı olmayaraq, onun nüfuzu həmişə şəxsiyyətinin məzmununa uyğun gəlmişdir.

Maqsud müəllim peşəkar təhsil işçisidir. Müasirlik, hər cür novatorluğa yeniliyə güclü meyl, təhsil, təlim prosesində yeniliklərin tətbiqi Maqsud müəllimin ən səciyyəvi həyat tərzidir. Sxolastik, şablon tərbiyə vasitələri ilə, mücərrəd pedaqoji müddəa və düsturlarla gəncliyin qəlbinə, ruhuna hakim kəsilməyin, onun mənəvi-psixoloji aləminə nüfuz etməyin mümkünsüzlüyünü dərindən dərk edən böyük intellekt sahibi kimi o, ən kamil, ən sınanmış yolları xüsusi çeviklik ilə fəhm edir, bu prinsipləri həyatında, fəaliyyətində, düşüncə və təfəkkür tərzində daha aydın, daha parlaq şəkildə gerçəkləşdirir.

Maqsud müəllim Vətənə, xalqa, xalqımızın maarifinə böyük və tükənməz sevgi nümunəsi, etalonudur. Elmimizin, mədəniyyətimizin, estetik dünyamızın daha mükəmməl zirvələrə qalxması, milli psixologiyamızın yad və zərərli elementlərdən təmizlənməsi, özünüdərk yollarında daxili-milli faktlara daha çox istinad etmək praktikası, müəyyən mənada milli təəssübkeşlik və mühafizəkarlıq - bütün bunlar onun parlaq şəxsiyyətinin təkrarolunmaz keyfiyyətləridir. Onun zəka və idrak işığı gənclərin qəlbini nurla doldurur, yollarına şəfəq saçır, onları böyük ideallara səsləyir. Həmkarları, tələbələri bu nadir ürfan yiyəsinin elmi-pedaqoji fəaliyyətindən faydalanır, ona dərin hörmət və ehtiram bəsləyirlər.

Maqsud müəllim elmi fəaliyyət sahəsi rəngarəng, tədqiqat meydanı geniş və əhatəli olan elm adamıdır. Onun "Sinqulyar həyəcanlanmış gecikən arqumentli adi diferensial tənliklər üçün optimal idarə məsələsinin həlli" mövzusunda (1983) namizədlik, "Silindirik və konik örtüklərin aeroelastik rəqsləri və dayanaqlığı" mövzusunda (2012) doktorluq dissertasiyaları, çoxsaylı kitab və elmi məqalələri, Azərbaycandan kənarda keçirilən beynəlxalq elmi konfrans və simpoziumlardakı çıxışları yüksək peşəkarlığı ilə seçilir və müəllifinin dərin elmi təfəkküründən xəbər verir. Son dərəcə orijinal şəxsiyyət olan M.Nəcəfovun elmi-pedaqoji fəaliyyəti əslində onun təmiz mənəvi dünyasının işıqlı təzahürüdür. Maqsud müəllim üçün elmə, maarifə qulluq etmək titanik bir enerjinin faydalı bir şəkildə sərf etmək, özünü də xalq üçün, doğma Azərbaycanımız üçün faydalı etmək prinsipidir. Bu zəngin mənəviyyatlı insan sanki fəal hərəkət üçün doğulub. Insanlara bağlılıq, xeyrxahlıq dinamizm onun yalnız insanlıq və vətəndaşlıq potensial, deyil, onun həyatının tərkib hissəsi, varlığının əsas rəmzidir.

Maqsud müəllim ömrünü ithaf etdiyi elm sahəsinə, ünsiyyətdə olduğu insanlara bütün varlığı ilə bağlıdır və bu təmas, bu sevgi onun öz varlığını qiymətli nemətlərlə zənginləşdirir. O, alimlik həyatının, elmi fəaliyyətinin zirvəsindədir. O da var ki, alim ömrü üçün zirvələr çoxdur. Onun ömür zirvələri təbiətdəki dağ zirvələrindən daha çox, daha uca, daha ibrətamizdir. Bu zirvələrdən biri qarlı-sazaqlı olanda, o biri güllü-çiçəkli, bahar nəfəsli olur, birinin bir yanı sıldırımlı qayalar əhatəsində olanda, o birinin dövrəsi əbədi meşəlik olur, çiçəkləri sayrışır, çeşmələri zümzümə edir. Alim-müəllim ömrünün zirvələri, eniş-yoxuşları isə əvəzedilməz bir aləm, fəlsəfi həyat yolu, yalnız uzaqdan baxanda bütün sehri, möcüzəsi görünən, qəlbimizi, ruhumuzu tərpədən xatirələr və xəzinələr səltənətidir.

Bəzən alim ömrünün sonsuz üfüqlərindən, poeziyasından, gözəlliklərindən danışarkən saxta, ritorik konsepsiyalar, şablon ifadələr bir-birini əvəz edir. Onun əsl insani həyatı, ömrünün bəşəri, fəlsəfi mündəricəsi, koloriti kölgədə qalır, sxematik cümlələr, soyuq və cansız rəqəmlər, faktlar arxasında böyük bir şəxsiyyətin həqiqi obrazı görünmür. M.Nəcəfov kimi alim-müəllim ömrünü bəzəyən iztirablar, onun yorğun yolları, itirilmiş zəngəzur iztirabları, doğma kəndi Ağudi nisgilləri, onun müqəddəs kədəri hansısa bir ötəri, xırda prinsipə qurban verilir, mahiyyət unudulur, şəxsiyyətin ər şairinə, ən təmiz, ən ideal bir səhifəsi örtülü qalır. Yaxşı ki, M.Nəcəfovun alim ömrünün, müəllim həyatının özünəməxsus yanğıları vardır və bu gur yanğının şəfəqləri ömür və həyat səhifələrinə işıq saçır, biz bu səhifələri xüsusi vurğunluqla və böyük minnətdarlıq hissləri ilə oxuyuruq. Maqsud müəllimin müqəddəs ömür səhifələri onun 70 illik şərəfli, mənalı və dəyərli həyat və fəaliyyət yolunun əks-sədasıdır.

Maqsud müəllimin ömrü min-min insan ömrünü əhatə edən, min-min insan yollarına işıq saçan şan-şöhrətli bir ömür, onun idelları isə doğulub boya-başa çatdığı Qərbi Azərbaycan torpağının, cənnət Zəngəzurun bulaqları kimi təmiz, saf, sadə və iddiasız bir ömürdür. Onun səsində insan ruhunun şeiriyyəti, müdriklik cazibəsi, üzündə yalnız onun özünəməxsus olan dəyişməz kolorit, baxışlarında həmişə axtardığımız, möhtac olduğumuz, gec-gec tapa bildiyimiz bir bəşər doğmalığı, bəşər həlimliyi vardır - bütün bunlar Maqsud müəllimin insan portretini tamamlayan bəşəri cizgilərdir.

Mənalı zaman və zəngin həyat məktəbi keçmiş Maqsud müəllim, yuxarıda qeyd edildiyi kimi, müdrik el ağsaqqalıdır. Öz varlığını piltə kimi əridib başqaları üçün nurlu yola çevirən möhtərəm insandır. O, ömrünün ən gözəl, ən çiçəkli illərini sosial qayğılara - həyatın, cəmiyyətin qayğılarına həsr etməkdədir. Məhz buna görə də belə bir nümunəvi insana, belə bir nadir varlığa, tərəddüdsüz demək olar ki, böyüklük, müdriklik səlahiyyəti verilir.

M.Nəcəfovun tərcümeyi-halı, keçdiyi həyat yolu adi insan ömrünün hüdudlarına sığsa da, bu yolda uğurla addımlayan alim öz daxili dünyasından ayrılan cığırları hər bir işıqlı amala doğru can atır, elmin üfüqlərində birləşərək kamil bir pedaqoq şəxsiyyətinin rəmzinə çevrilir. Bunun bir başa nəticəsidir ki, Maqsud müəllim 15 il rəhbərlik etdiyi Riyaziyyat və informatika fakültəsinin dekanı kimi ağır zəhmətlərə qatlaşmış, zehnini, fikrini ən aktual, gərəkli problemlərin həllinə sərf etmiş, yorulmaq bilmədən öz fərdi, orijinal alimlik və müəllimlik keyfiyyətlərini təsdiq etmiş, səriştəli təşkilatçı kimi nümunə rolunu oynaya bilmiş, ətrafında müsbət, təsirli rezonans yarada bilmişdir. Yeri gəlmişkən xüsusi qeyd olunmağa layiqdir ki, M.Nəcəfov ümummilli liderimiz Heydər Əliyevə müraciət edən 91 vətənpərvər ziyalılarımızdandır. Hazırda o, YAP-ın ilk ərazi təşkilatının və Səbail rayon təşkilatının İdarə Heyəti və Siyasi Şurasının da fəal üzvüdür. 1999-cu ildən o, Xətai rayon bələdiyyəsinin üzvü, sosial və ekologiya komissiyasının sədri vəzifəsinin öhdəsindən də bacarıqla gəlir.

Bütün fəaliyyəti boyu o, vətəndaş bir insan, istedadlı alim, fəal pedaqoq və ictimai xadim kimi real vəziyyətləri ön plana çəkmiş, riyaziyyat elminin vacib problemlərini nəzərə almışdır. Həssaslıq, bütöv cəmiyyət üçün, doğma evi bildiyi ADPU-nun ümumi taleyi üçün məsuliyyət hissi, bütövlük onun alim-müəllim,vətəndaş simasının əsas cizgiləridir. Inanırıq ki, Maqsud müəllim riyaziyyatın aktual problemlərinə həsr olunmuş dərin məzmunlu yeni əsərləri ilə elmimizi daha da zənginləşdirəcəkdir.

**Məhərrəm Hüseynov, professor**

# ADPU-nun Ağcabədi Filialında 18 Oktyabr - Dövlət Müstəqilliyi Günü münasibətilə elmi-praktik konfrans

Oktyabrın 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Ağcabədi Filialında Dövlət Müstəqilliyi Günü münasibətilə elmi-praktik konfrans keçirildi. Konfransda filialın professor-müəllim heyəti və Ağcabədi Rayon İcra Hakimiyyətinin (RİH) İctimai-siyasi və humanitar məsələlər şöbəsinin müdir müavini Təyyar Hacıyev iştirak edirdi. Konfransda öncə ümummilli liderimiz Heydər Əliyevin xatirəsi bir dəqiqəlik sükutla yad edildi. Azərbaycanın Dövlət Himni səsləndirildi.



Konfransı giriş sözü ilə açan filialın direktoru, dosent Mətanət Fərzəliyeva tarixən xalqımızın milli müstəqillik uğrunda apardığı mübarizə və bu mübarizəyə dərin inamın bəhrəsi olaraq bugünkü ölkə həyatımızı nümunə göstərdi. Qeyd etdi ki, müstəqil ölkəmiz etibarlı əllərdədir və Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan cənab İlham Əliyev ulu öndərimiz Heydər Əliyevin dövlətçilik ənənələrinə sədaqətlə xidmət edir.

Konfransda milli müstəqillik günü ilə əlaqədar Ulu Öndərimizin çıxışlarını əks etdirən videoçarx nümayiş etdirildi.

"Azərbaycanın dövlət müstəqilliyinin bərpa olunmasını yetişdirən tarixi şərait" mövzusunda məruzə edən filialın tərbiyə işləri üzrə direktor müavini, dosent Mahir Səlimov bildirdi ki, xalqımız beş min illik dövlətçilik ənənələrinə malikdir. Tarixin müxtəlif dönəmlərində xalqımızın müstəqilliyi əlindən alınmış, əsarətdə yaşamışdır. Bu isə böyük imperialist dövlətləri ilə qonşu olmağımızla əlaqədar olmuşdur. Azərbaycan xalqı nə qədər əsarətdə yaşasa da, onun içindəki azadlıq, istiqlaliyyət duyğusu ölməmiş, zamanı gəldikcə mübarizəyə atılmaqdan çəkinməmişdir.

Xalqlar həbsxanasına çevrilən rus imperiyasının tarixi süqutu 1918-ci ildə Azərbaycan Xalq Cümhuriyyətinin yaradılmasına zəmin hazırladısa, Sovetlər Birliyinin daxili tənəzzülü xalqların öz müqəddəratını müəyyən etmək fürsətini yaratdı. Öz azadlığı, suverenliyi uğrunda meydanlara atılan xalqımız 1990-cı ilin qanlı Yanvar faciəsi ilə müstəqilliyə aparan yolun manifestini yazdı. 1991-ci ilin oktyabr ayının 18-də Azərbaycan xalqı dövlət müstəqilliyini elan etdi.

"Ulu öndər Heydər Əliyev müstəqil Azərbaycan dövlətinin memarıdır" mövzusunda məruzə edən İctimai, təbiət fənləri və onların tədrisi metodikası kafedrasının baş müəllimi Anar Kərimli bildirdi ki, ulu öndər Heydər Əliyev XX əsr Azərbaycan siyasətinin ən parlaq simasıdır. Ulu Öndərin həyata keçirdiyi taleyüklü məsələlər, nəzəri və praktiki diplomatiyaya verdiyi töhfələr hələ uzun illər xalqımıza gərəkli olacaq və onu işıqlı sabaha səsləyəcəkdir. Məhz Heydər Əliyevin zəngin həyat təcrübəsi və siyasi dünyagörüşünün nəticəsində indi Azərbaycan qüdrətli, qüvvətli bir ölkəyə çevrilmiş, sabit, tolerant, yüksək mədəniyyətli bir xalqın dövləti kimi dünyaya tanınmışdır.

"Müstəqil Azərbaycan dövləti beynəlxalq aləmdə" mövzusunda məruzə edən İctimai, təbiət fənləri və onların tədrisi metodikası kafedrasının dosenti Məhəmməd Hüseynov bildirdi ki, müstəqil Azərbaycan dövlətinin beynəlxalq aləmdə tanınması, nüfuzlu bir ölkə kimi qəbul edilməsində xalqımızın ümummilli lideri Heydər Əliyevin böyük rolu olmuşdur. Azərbaycanın BMT-yə üzvlüyündən sonra onun ali kürsüsündən xalqımızın başına gətirilən milli faciələrin səbəbkarı olan erməni işğalçılarının törədiyi soyqırımı aktının və torpaqlarımızın 20 faizinin işğal edilməsi kimi məsələlərin dünyaya tanıdılması Heydər Əliyevin vətəndaşlıq mövqeyinin bariz nümunəsi kimi qiymətləndirilməlidir. Bu gün Azərbaycan dünyanın tanınmış, inkişaf etmiş ölkələri ilə sıx siyasi, iqtisadi və mədəni əlaqələr qurmuşdur. Bütün bunlar Ulu Öndərimizin müstəqil Azərbaycan dövləti haqqında dediyi fikirləri - onun əbədiliyi, daimiliyi və dönməzliyini sübuta yetirən amillərdir.

"Milli təhsilimiz müstəqillik dövründə" mövzusunda məruzə edən Xüsusi və ümumelmi fənlər kafedrasının müdiri Tahir Kərimli Azərbaycan təhsilinin dünəni, buğünü və gələcəyi ilə bağlı ətraflı danışdı. Xalqımız müstəqillik əldə etdikdən sonra təhsil sahəsində əldə edilmiş nailiyyətlər fərəh hissi ilə qeyd olundu. Azərbaycan təhsilinə xüsusi diqqət və qayğı göstərən ümummilli liderimiz Heydər Əliyevin "Təhsil millətin gələcəyidir!" fikirinin əsl mahiyyəti açıqlandı.

"Azərbaycan ədəbiyyatı müstəqillik illərində" mövzusunda məruzə edən Dillər, ədəbiyyat və onların tədrisi metodikası kafedrasının müdiri, dosent Vaqif Allahverdiyev həmin illərdə yaranmış ədəbiyyat nümunələrindən, dövrün yetişdirdiyi sənətkarların həyat və bədii fəaliyyətindən danışdı. Qeyd etdi ki, müstəqillik illərində yaradılmış ədəbiyyatımızın böyük əksəriyyəti öz mayasını, rişəsini xalqımızın qanı bahasına əldə etdiyi suverenlik, azadlıq və istiqlaliyyət duyğusundan almışdır.

"Müstəqil Azərbaycanda multikultural dəyərlər" mövzusunda məruzə edən tədris və elmi işlər üzrə direktor müavini, dosent Seymur Süleymanov Azərbaycanın tolerant, mədəniyyətlərin qovuşduğu və inkişaf etdiyi ölkə kimi dünyada tanınmasından danışdı.

Məruzələr ətrafında çıxışlar dinlənildi. Pedaqoji fakültənin 401-ci qrup tələbəsi Lamiyə Qarayeva müstəqil Azərbaycan dövlətinin azad və xoşbəxt gənci kimi dövlətimizin gələcəyinə böyük ümidlər bəslədiyini ifadə etdi.

Sonda çıxış üçün söz Ağcabədi RİH-in İctimai-siyasi və humanitar məsələlər şöbəsinin müdir müavini Təyyar Hacıyevə verildi. O, konfrans iştirakçılarını bayram münasibətilə təbrik etdi və onlara uğurlar arzuladı.

# ADPU-nun Şamaxı Filialında Azərbaycanın dövlət müstəqilliyinin bərpasının 27-ci ildönümü qeyd olundu

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı Filialında müvəqqəti olaraq filialda yerləşdirilmiş Anar Babaşov adına Şəhriyar qəsəbə tam orta məktəbin kollektivi ilə birgə Azərbaycanın dövlət müstəqilliyinin bərpasının 27-ci ildönümünə həsr olunmuş tədbir keçirildi. Tədbirdə əvvəlcə Azərbaycanın Dövlət Himni səsləndirildi.

Filialın direktoru, filologiya üzrə fəlsəfə doktoru, dosent Tünzalə Yusifova həm filialın, həm də orta məktəbin kollektivini, tələbə və şagirdləri bu böyük bayram münasibətilə təbrik edərək qeyd etdi ki, 27 il əvvəl Sovet Sosialist Respublikaları İttifaqının dağılması ilə yaranan tarixi şərait nəticəsində Azərbaycan öz müstəqilliyini yenidən bərpa etdi. Lakin Ermanıstan silahlı qüvvələrinin təcavüzü nəticəsində başlanan Qarabağ müharibəsi, o zamankı dövlət rəhbərliyinin siyasi səriştəsizliyi, separatçılıq hərəkatı dövlətin müstəqilliyini yenidən təhlükə altına saldı. Məhz böyük siyasi təcrübəyə malik olan Heydər Əliyevin yenidən hakimiyyətə qayıdışı ilə bu təhlükə sovuşdu. Bu gün artıq Azərbaycan həm siyasi, həm də iqtisadi cəhətdən dünyanın qüdrətli dövlətlərindən birinə çevrilib.

Tədbirin rəsmi hissəsində Humanitar və xüsusi fənlər kafedrasının dosenti, tarix üzrə fəlsəfə doktoru Fariz Xəlilli 28 may 1918-ci ildə yaranan Azərbaycan Xalq Cümhuriyyətinin siyasi varisi olan müasir Azərbaycan Respublikasının yaranması və inkişafı mövzusunda geniş məruzə ilə çıxış edərək bildirdi ki, əgər müstəqillik, Azərbaycanın suveren dövlət kimi mövcud olması tarixi zərurətdən irəli gələn hadisə idisə, Azərbaycanın müstəqilliyi, əbədiliyi ümummilli lider Heydər Əliyevin adı və fəaliyyəti ilə bağlı olması müasir tariximizin danılmaz faktıdır.

Sonra "İbtidai sinif müəllimliyi" ixtisasının I tədris ili tələbəsi Günay Nuriyeva müasir gənclərin müstəqilliyimizin təminatçıları olmasından danışaraq qeyd etdi ki, gənclərin ən ümdə vəzifəsi çətinliklə əldə olunan müstəqilliyi göz-bəbəyi kimi qorumaqdır.

Tədbirin bədii hissəsində orta məktəbin şagirdləri "Sizə salam gətirmişəm" mahnısı ilə tədbir iştiralçılarını salamladılar. Tədbirin aparıcıları II tədris ili tələbələri Məhərrəm Məhərrəmov və Gültac Səmədova çıxışçıları növbə ilə səhnəyə dəvət etdilər. I tədris ili tələbələri İnci Qurbanova, Nicat Tahirov və Dərgah Məcnunzadə "Azərbaycan deyəndə", III tədris ili tələbəsi Günay Məmişova özünün qələmə aldığı "Müstəqil dövlətim, Azərbaycanım", VI sinif şagirdi Gülbahar Sərxanova "Azərbaycan", II tədris ili tələbəsi Güldəstə Nəsibli və IV tədris ili tələbəsi Nicat Məmmədov "Qalx ayağa, Azərbaycan" şeirlərini səsləndirdilər. VII sinif şagirdləri Nihat Cəbiyevin və Vidadi Əhmədovun klarnetdə Azərbaycan xalq mahnılarından parçalar ifa etməsi, X sinif şagirdi Aydan İbadovanın və Əlmirzə Kazımovun "Tomris və Kirin tarixi dialoqu"nu canlandırmaları, VIII sinif şagirdi Mahsun Azadxanlının "Qurban olum, Azərbaycan" və III tədris ili tələbəsi Aytən Əhmədovanın "Azərbaycan" mahnılarını ifa etmələri tədbir iştirakçıları tərəfindən alqışlarla qarşılandı.



Redaktor: Günay BAĞIRLI

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az Fotolar Nurlan Səmədovundur Şəhadətnamə № 191

Sifariş: 3292 Sayı: 1500 Çapa imzalanıb: 31.10.2018-ci il

ADPU-nun İctimaiyyətlə əlaqələr və marketinq şöbəsində yığılıb, "Azərbaycan" Nəşriyyatında səhifələnib və ofset üsulu ilə çap edilib.